**HUMANİTAR VƏ SOSİAL ELMLƏR**
**HUMANITIES AND SOCIAL SCIENCES**

https://doi.org/10.36719/2789-6919/43/7-10

**Elburus Vəliyev**
Naxçıvan Dövlət Universiteti
filologiya üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0002-1462-305X
elbrusveliyev79@gmail.com
**Şəbnəm Əliyeva**
Naxçıvan Dövlət Universiteti
dissertant
https://orcid.org/0000-0002-9716-7629
shebnemeliyeva27@gamil.com

# Sintaksisə dair bilik, bacarıq və vərdişlər aşılamağın nəzəri və metodik əsasları

**Xülasə**

Sintaksis (eləcə də morfologiya) leksika və frazeologiyadan üslubi dəqiqliyinə və ciddi funksionallığına görə də fərqlənir. Belə ki, müxtəlif sintaktik vahidlər və sintaktik fiqurlar nitq sferasında, poetik mühitdə üslubi rəngə boyanır, söz birləşmələri, cümlə tipləri, müxtəlif konstruksiyalar hər hansı bir prosesə məruz qalır, müxtəlif məqsədlər üçün istifadə olunur. Nitq şəraitindən asılı olaraq bədii əsərlərin dilində bir sıra sintaktik hadisələr baş verir.

Bütün sahələrdə olduğu kimi, XIX əsr dilçilikdə, xüsusilə sintaksis sahəsində yeni bir dövr açmışdır. Bu sahədə bir çox mühüm və əhəmiyyətli işlər görülmüşdür. Amma sonrakı dövr tədqiqatlarını araşdırdıqca, çatışmazlıqların hələ də qaldığının şahidi oluruq.

Dilimizin sintaktik quruluşu Azərbaycan türk şifahi nitqinin formalaşması ilə bir vaxtda təşəkkül tapmışdır və daimi inkişafdadır - minilliklər boyu tədricən səlisləşmə, təkmilləşmə yolu ilə irəliləyir. Sintaktik quruluşda baş verən inkişaf və mürəkkəbləşmə xalqımızın təfəkkür zənginliyi ilə bağlıdır.

Məqalənin aktuallığı sintaksisə dair bilik və bacarıqların formalaşdırılması yollarının izahını vermək, müasir linqvistika və didaktika konsepsiyalarının şərhini açıqlamadan ibarətdir. Burada sintaksisdən bilik, bacarıq və vərdişlər aşılamağın konkret məqsəd və vəzifələri, bu sahədə qarşıya qoyulan tələblər bir daha dəqiqləşdirilmiş və bəzi əlavələrlə dərinləşdirilmişdir.

***Açar sözlər:*** *Azərbaycan dili, linqvistika, sintaksis, söz birləşməsi, cümlə*

**Elburus Valiyev**
Nakhchivan State University
PhD in Philology
https://orcid.org/0009-0002-1462-305X
elbrusveliyev79@gmail.com
**Shabnam Aliyeva**
Nakhchivan State University
PhD student
https://orcid.org/0000-0002-9716-7629
shebnemeliyeva27@gamil.com

# Theoretical and Methodological Foundations of Instilling Knowledge, Skills and Habits About Syntax

**Abstract**

Syntax (as well as morphology) differs from lexis and phraseology in its stylistic accuracy and serious functionality. Thus, various syntactic units and syntactic figures are painted in a stylistic color in the speech sphere, in the poetic environment, word combinations, sentence types, various constructions are subjected to any process, are used for various purposes. Depending on the speech conditions, a number of syntactic phenomena occur in the language of literary works.

As in all fields, the 19th century opened a new era in linguistics, especially in the field of syntax. Many important and significant works were done in this area. But as we examine the research of the later period, we witness that shortcomings still remain.

The syntactic structure of our language was formed simultaneously with the formation of Azerbaijani Turkic oral speech and is in constant development - it has been gradually progressing through millennia, gradually becoming more fluent and improved. The development and complexity occurring in the syntactic structure is associated with the richness of the thinking of our people.

The main purpose of the article is to explain the ways of forming knowledge and skills in syntax, to explain the interpretation of modern linguistics and didactics concepts. Here, the specific goals and objectives of instilling knowledge, skills and habits in syntax, the requirements set in this area are once again clarified and deepened with some additions.

***Keywords:*** *Azerbaijani language, linguistics, syntax, word combination, sentence*

## Giriş

Ümumtəhsil müəssisələrində elmi dünyagörüşün formalaşmasında Azərbaycan dili dərslərinin xüsusi yeri var. Çünki Azərbaycan dilinin təlim-tərbiyə prosesində praktik cəhətdən rolu və əhəmiyyəti böyükdür. Azərbaycan dili dərslərinin tədrisində dilimizin hər bir bölməsi şagirdlərin elmi nəzəri dünyagörüşünə təsir edir. Son illərdə tədrisin yeni təlim metodları əsasında qurulması və bu sahədə aparılan məqsədyönlü işlər Azərbaycan dili dərslərinin də günün tələb səviyyəsində aparılması zərurətini yaradır.

Təlim-tərbiyə işinin təkmilləşdirilməsi, bu sahədəki problemlərin optimal həlli məsələsi bütün dövrlərdə daim diqqət mərkəzində olmuşdur. Məktəbin ən mühüm, daimi vəzifəsi böyüməkdə olan nəslə elmlərin əsasları üzrə dərin və möhkəm biliklər vermək, həmin bilikləri təcrübədə tətbiq etmək vərdişləri və bacarıqları aşılamaq, elmi dünyagörüşü formalaşdırmaq olmuşdur.

Qeyd etmək lazımdır ki, bu vəzifəni həyata keçirməkdə, xüsusən şagirdlərdə elmi dünyagörüşü formalaşdırmaqda Azərbaycan dili təliminin əvəzsiz rolu vardır. Linqvistik hadisələrdə, ümumiyyətlə, dilin mahiyyətində dialektikanın bir sıra qanunauyğunluqları, xüsusilə qarşılıqlı əlaqə, qarşılıqlı asılılıq, məzmun və formanın vəhdəti öz əksini tapır.

**Tədqiqat**

Dil təlimində mahiyyət ilə hadisə, forma ilə məzmun arasındakı əlaqələrin dərk olunması təfəkkür inkişafını təmin edir. Bu prosesin özündə də bir daha dialektik vəhdət vardır. Dialektik vəhdət, hər şeydən öncə, onunla bağlı olur ki, hər bir qrammatik hadisənin iki tərəfi var: ifadə olunmuş daimi qrammatik məna və bir də onun ifadə vasitəsi. Hər hansı qrammatik hadisə öyrənilərkən bu iki tərəf hökmən nəzərə alınmalıdır.

Azərbaycan dili tədrisinin linqvistik və didaktik əsasları iki sahədə aparılan tədqiqatların nəticələrindən bəhrələnir. Lakin bu sahələrdən hər birinin də vəhdətdə olduğu sahələr vardır. Elə buna görə də linqvistika və didaktika kimi elm sahələrinin ümumi cəhətlərindən istifadə etmək bu günün tədqiqatları üçün çox vacibdir. Müasir linqvo-didaktikanın aktual məsələlərini nəzərə almadan linqvistikanın gələcəyini və strateji istiqamətini müəyyən etmək mümkün olmadığı kimi, linqvistikanın əsaslarını hərtərəfli və kiçik hissələrinədək diqqətlə öyrənmədən linqvo-didaktikanı inkişaf etdirmək də olmaz (Novruzova, 2002).

Məlumdur ki, sintaksisin nəzəri məsələlərinə bələd olmaq sintaksisin tərkib hissələrinin bir-birinə münasibətdə sərhədini müəyyənləşdirmək üçün əsasdır. Əks halda, bu sərhədlərin pozulması sintaktik normaların praktik cəhətdən də pozulması deməkdir. Odur ki, söz birləşməsi və cümlə sintaksisinin nəzəri problemləri üzərində bir qədər ətraflı dayanmaq mühüm zərurət kəsb edir. Sintaksisin tədrisinin nəzəri və metodik məsələlərindən danışarkən, ilk növbədə sintaksisin predmeti məsələsinin üzərində qısaca dayanmaq lazım gəlir.

Sintaksisə dair tədqiqatların geniş şəkildə inkişaf etməsinə baxmayaraq, tədqiqatçılar sintaksisi hələ az öyrənilmiş sahə hesab edirlər. Bu cəhət, aydın məsələdir ki, sintaksisin tədrisi problemləri ilə bağlı olan tədqiqatçıları da düşündürməyə bilməz.

Sintaksis təlimində dilin vahidləri sintaktik səviyyədə götürülür; bu vahidlərin ierarxik təşkili və müxtəlif səviyyələri söz və ya söz birləşməsi - cümlə - mürəkkəb cümlə - mətn mənimsədilir. Onlara müxtəlif aspektlərdən yanaşılması vahidlərin formal təşkili aspekti, semantik, kommunikativ, habelə sintaktik vəzifələrin qanunauyğun birləşməsi, onların birləşməsi üsulları, əlaqələnməsi və bu zaman onların aralarında yaranan sintaktik münasibət - təyinedicilik, obyekt, səbəb - nəticə və s. öyrənilir (İbrahimli, 2018).

Qeyd etmək lazımdır ki, dil fikrin ifadəçisi olub, hər hansı bir məlumatı başqasına çatdırmaq işinə xidmət edir. Bu vəzifəni daha çox, sintaksisin əsas vahidi kimi, cümlə yerinə yetirir. Söz, cümlə tərkibində müxtəlif şəkillərə düşür, yəni digər sözə uyğunlaşıb onunla qrammatik cəhətdən bağlanır. Sözlərin bu cür birləşməsinə misal olaraq mübtəda ilə xəbərin, həmcins üzvlərin və tərkib daxilindəki sözlərin uyğunlaşmasını və cümlədən kənarda əmələ gələn birləşmələri qeyd edə bilərik. Bunların hamısı ya tabelilik, ya da tabesizlik əlaqələri nəticəsində baş verir.

Nitqdə cümlələrin özləri də bir-biri ilə sıx surətdə bağlı olur; məna və qrammatik cəhətdən birləşərək cümlə birləşmələri funksiyasında çıxış edir. “Cümlə birləşmələri” içərisində mürəkkəb cümlə və mürəkkəb sintaktik bütövlülük (mətn) xüsusilə seçilir. Söz birləşməsi, sadə cümlə və mürəkkəb sintaktik bütövlülük - bunların hamısı sintaksisin tədqiqat obyektini təşkil edir (Abdullayev, 1998).

Bütün bu hadisələrlə şagird yalnız praktik şəkildə tanış edilmir. Proqram və dərsliklərdə söz birləşməsi və cümlə probleminin nəzəri məsələləri üzərində xüsusi olaraq dayanılır. Həmin vahidlərin şərhinə olan ehtiyac da məhz buradan doğur. Cümlə mürəkkəb, çoxsahəli sintaktik vahid olduğu üçün onu müxtəlif cəhətlərdən öyrənmək lazım gəlir.

Sintaksis üzrə müasir əsərlərdə cümlə bir sıra aspektlərdən tədqiq olunur ki, onlardan ən mühümü və başlıcaları bunlardır: məntiqi, struktur, kommunikativ və semantik. Həmin aspektlərdən hər birinin fərqləndirici xüsusiyyəti üzərində konkret olaraq dayanaq.

Cümlənin məntiqi aspektdə tədqiqi dilçiliyin ən yaxşı ənənələri ilə bağlıdır. Məntiqi - sintaktik istiqamət dildə təfəkkürün dialektik vəhdətinə əsaslanır. Bu aspektdə dillə təfəkkürün forma və vahidlərinin qarşılıqlı əlaqə və münasibətləri aydınlaşdırılır. A.D.Çesnikova yazır ki, bu qarşılıqlı münasibətlərdən kənarda göstərilən forma və vahidlər mövcud deyil, ona görə də ayrılıqda onların təbiəti dərk edilə bilməz.

Məntiqi istiqamətə tərəf çıxanların fikrincə, cümlənin ən mühüm xassəsi fikrin formul və ifadəsi ilə əlaqədardır. Filosoflar və dilçilər fikrin üç növünü göstərirlər: “məlumatı fikir”, “sualedici fikir”, “təhrikedici fikir”.

Dərsliklərin dili ilə desək, cümlə ya məlumat, ya sual, ya da əmr məqsədilə işlənir. Fikrin bu növlərində məna və quruluş fərqi, adətən, ifadənin məqsədindən asılılıq cümlənin (nəqli, sual və əmr cümlələri) özünəməxsus xüsusiyyətlərində əks olunur.

Fikrin üzvlənmə dərəcəsi, onda qarşılıqlı əlaqə və münasibətləri ifadə olunan fikrin quruluş komponentlərinin səciyyəsi sadə cümlənin növünü müəyyən edir. Qeyd etmək lazımdır ki, məntiqi aspekt cümlənin quruluşu ilə sıx surətdə bağlıdır: belə ki, fikir cümlənin bu və ya digər quruluş sxemi ilə ifadə olunur, fikrin üzvlənmə dərəcəsi cümlənin üzvlənmə səviyyəsini müəyyən edir. Cümlənin öyrənilməsinin struktur aspekti müasir dərslikdə yeni bir istiqamətin - konstruktiv sintaksisin meydana çıxmasına səbəb olmuşdur.

Komponentlər - struktur sxemin elementləri, adətən, mübtəda və xəbərin mövqeyində cəmlənir. Odur ki, cümlənin struktur sxemini məktəb qrammatikasında işlədilən cümlənin qrammatik əsası termininə aid etmək lazım gəlir. Konstruktiv sintaksisdə struktur sxemə “cümlənin birinci mühüm

əlaməti" kimi baxılır. Azərbaycan dilində ən çox qurulan struktur sxem (model) "isim" + "təsriflənən feil" və "isim" + "isim"dir. Cümlələrin daha çox hissəsi "isim" + "təsriflənən feil" sxemi üzrə qurulur və bunlar feili cümlələr adlanır. Cümlələrin "isim+ isim" sxemi əsasında qurulanları isə ismi cümlələr hesab edilir. Sintaksis fərdi nitqdə və obrazların dilində olan bütün konkret cümlələri öyrənmir. Onun vəzifəsi yalnız cümlələrin struktur sxemini (modelini) müəyyən etməkdən ibarətdir (Kazımov, 2007).

Cümlənin öyrənilməsinin kommunikativ aspekti cümlə üzvlərinin aktual üzvlənməsində öz əksini tapır. Bu nəzəriyyə tərəfdarlarının fikrincə, cümlənin ən ümdə vəzifəsi onun ünsiyyət vasitəsi kimi çıxış etməsindədir.

Cümlənin aktual üzvlənməsi zamanı hazırkı (mövcud) məlumat, yəni əvvəlki cümlədən, konteksdən məlum olan və "yeni" haqqında danışılan kommunikativ mərkəz üzə çıxır. Bu mərkəz – "yeni" məlumat - baş və ya ikinci dərəcəli üzvlərlə ifadə oluna bilər. Məsələn:

- Yayda harada dincəldin?
- Yayda Batabatda dincəldim.

Danışan faktdan çıxış edərək sual qoyur, ona ümumi şəkildə məlum olanların əsasında məlum olmayan detalları öyrənir. Məhz bunu suallar vasitəsilə aşkar edir. Verilən cavabda məlum olan – "Yayda dincəldim", yeni olan isə "Batabatda" komponentidir. Cümlədə yeni olanın qrammatik ifadə vasitəsi söz sırasıdır. Elə buna görə IV sinif üzrə dil dərslərində şagirdlərə yeni proqramın tələbinə görə intonasiyanın mühüm əhəmiyyəti dərk etdirilməli və bu sahədə onlara zəruri bacarıqlar aşılanmalıdır.

## Nəticə

Son illərdə müxtəlif istiqamətlərin tərəfdarları olan dilçilər (linqvistlər) dilin semantik cəhətdən öyrənilməsinə xüsusi meyil göstərirlər. Cümlənin tədqiqinin semantik aspekti daha bir sıra aspekt-lərin meydana çıxmasına səbəb olmuşdur ki, bu istiqamətlərin hər birində cümlənin semantik mənası müxtəlif cür həll olunur. Həmin istiqamətlər üçün bir ümumi cəhət nitq semantikası sərhədinin ayrılmasına cəhd göstərilməsindən ibarətdir.

Beləliklə, hər hansı bir konkret cümlə dil və nitqin vahidi deməkdir. Bu dil vahidini - cümləni təşkil edən sözlər müəyyən model üzrə qurulur: bunlar (sözlər) struktur sxemin komponentlərinin məna kateqoriyalarını və məntiqi üzvlənməsini müəyyənləşdirən dil semantikasına malik olur.

Qeyd olunmalıdır ki, cümlə nitqdə dilin məntiqi üzvlənmə sistemi, məna tipi və quruluş sxeminin xarakteri ilə bağlıdır. Nitq vahidi - hər bir konkret cümlə öz fərdi mənası ilə xarakterizə olunur.

## Ədəbiyyat

1. Abdullayev, Ə. (1998). *Aktual üzvlənmə və mətn*. Xəzər Universiteti.
2. Abdullayev, K. (1998). *Azərbaycan dili sintaksisinin nəzəri problemləri*. Maarif.
3. *Azərbaycan dilinin qrammatikası*. (1959). II hissə. Sintaksis. Azərbaycan SSR Elmlər Akademiyası.
4. Əlizadə, F. (1998). *Cümlənin aktual üzvlənməsi*. Bakı Universiteti.
5. Əlizadə, F. (1981). *Aktual üzvlənmə komponentlərinin funksiyası və tərkibi*. Azərbaycan dilçiliyi məsələləri. ADU.
6. İbrahimli, Ə. (2018). *Sintaksisin aktual problemləri*.
7. Kazımov, Q. (2007). *Müasir Azərbaycan dili. Sintaksis*. Təhsil.
8. *Müasir Azərbaycan dili*. (2007). IV hissə. Sintaksis. Şərq-Qərb.
9. *Müasir Azərbaycan dili*. (1981). Sintaksis. III cild. Azərbaycan SSR Elmlər Akademiyası.
10. Novruzova, N. (2002). *Mətn sintaksisi*. Təhsil.
11. Vəliyev, K. (1981). *Cümlənin semantik üzvlənməsi*. Azərbaycan dilçiliyi məsələləri. ADU.

Daxil oldu: 03.12.2024
Qəbul edildi: 11.03.2025

https://doi.org/10.36719/2789-6919/43/11-14

**Гюнель Алиева-Мамедова**
Бакинский Государственный Университет
доктор философии по истории
https://orcid.org/0000-0002-6570-3554
gunkaa.m@gmail.com

# Использование идеологий и проблемы лидерства силовых центров на южном Кавказе. Зангезурский коридор

**Резюме**

В статье рассматриваются политические идеологии, интересы ведущих стран мира на Южном Кавказе и роль транспортных коммуникаций в формировании нового миропорядка. Освещается политическая борьба государств за утверждение сфер влияния, которая в условиях новых реалий приводит к сближению позиций, ранее противоборствующих сторон.

Начало эпохи постмодерна привело к активной позиции многих государств (силовых центров мира). Ускорение амбиций определённых государств способствовало созданию многочисленных идеологий и к столкновению этих интересов. В итоге государства стали уделять внимание открытию и использованию транспортных коммуникаций, в частности, в регионе Южного Кавказа. В современном мире существует огромное количество идеологий, которые применяются для разрешения тех или иных конфликтов и усиления лидерства. Нагорно-Карабахская проблема не стала исключением. Становятся ясны все последствия армянской агрессии против азербайджанского народа. Нехватка положительных элементов в армянском обществе стало фундаментом для начало армянской шовинистической власти и привело к началу войны против Азербайджанской Республики.

***Ключевые слова:*** *коммуникация, интересы, противоборство, лидерство, Зангезур*

**Günel Əliyeva-Məmmədova**
Bakı Dövlət Universiteti
tarix üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0002-6570-3554
gunkaa.m@gmail.com

# İdeologiyalardan istifadə və Cənubi Qafqazda güc mərkəzlərinin rəhbərliyinin problemləri. Zəngəzur dəhlizi

**Xülasə**

Məqalədə siyasi ideologiyalar, dünyanın aparıcı dövlətlərinin Cənubi Qafqazdakı maraqları və yeni dünya düzəninin formalaşmasında nəqliyyat kommunikasiyalarının rolu araşdırılır. Yeni reallıqlar kontekstində əvvəllər qarşı-qarşıya duran tərəflərin mövqelərinin yaxınlaşmasına səbəb olan təsir dairələri yaratmaq uğrunda dövlətlərin siyasi mübarizəsi vurğulanır.

Postmodern dövrün başlanğıcı bir çox dövlətlərin (dünyanın güc mərkəzləri) fəal mövqeyinə gətirib çıxardı. Bəzi dövlətlərin ambisiyalarının sürətlənməsi çoxsaylı ideologiyaların yaranmasına və bu maraqların toqquşmasına şərait yaratdı. Bunun nəticəsidir ki, dövlətlər xüsusilə Cənubi Qafqaz regionunda nəqliyyat kommunikasiyalarının açılmasına və istifadəsinə diqqət yetirməyə başladılar. Müasir dünyada müəyyən münaqişələri həll etmək və liderliyi gücləndirmək üçün istifadə olunan çoxlu sayda ideologiyalar mövcuddur. Dağlıq Qarabağ problemi də istisna deyildi. Ermənistanın Azərbaycan xalqına qarşı təcavüzünün bütün nəticələri aydınlaşır. Erməni cəmiyyətində müsbət elementlərin olmaması erməni şovinist hakimiyyətinin başlanması üçün əsas oldu və Azərbaycan Respublikasına qarşı müharibənin başlanmasına səbəb oldu.

***Açar sözlər:*** *ünsiyyət, maraqlar, qarşıdurma, liderlik, Zəngəzur*

**Gunel Aliyeva-Mammadova**
Baku State University
PhD in history
https://orcid.org/0000-0002-6570-3554
gunkaa.m@gmail.com

# Using of Ideologies and Problems of Leadership of Power Centers in the South Caucasus. Zangazur Corridor

## Abstract

The article examines political ideologies, interests of the world's leading countries in the South Caucasus and the role of transport communications in the formation of a new world order. It highlights the political struggle of states to assert spheres of influence, which in the context of new realities leads to a convergence of positions of previously opposing parties.

The beginning of the postmodern era led to an active position of many states (power centers of the world). The acceleration of ambitions of certain states contributed to the creation of numerous ideologies and to the clash of these interests. As a result, states began to pay attention to the opening and use of transport communications, in particular, in the South Caucasus region. In the modern world, there are a huge number of ideologies that are used to resolve certain conflicts and strengthen leadership. The Nagorno-Karabakh problem is no exception. All the consequences of the Armenian aggression against the Azerbaijani people are becoming clear. The lack of positive elements in Armenian society became the foundation for the beginning of Armenian chauvinistic power and led to the beginning of the war against the Republic of Azerbaijan.

***Keywords:*** *communication, interests, confrontation, leadership, Zangezur*

## Введение

В современном мире существует огромное количество идеологий, которые применяются для разрешения тех или иных конфликтов и усиления лидерства. Нагорно-Карабахская проблема не стала исключением.

Известный американский психолог А. Маслоу, полагает, что одной из первичных потребностей человека, является потребность в безопасности, поэтому вопрос о мирном сосуществовании государств является не просто актуальным — это базовая необходимость, для дальнейшего развития общества (Teshlek). Социолог и конфликтолог Л.Козер оценил конфликт следующим образом: *«Конфликт – это противоборство социальных субъектов, возникающее из-за дефицита власти, статуса или средств, необходимых для удовлетворения ценностных притязаний, и предполагающее нейтрализацию, ущемление или уничтожение противника»* (Griban, Kabichno, 2017, с. 34).

**Исследование**

Становятся ясны все последствия армянской агрессии против азербайджанского народа. Нехватка положительных элементов в армянском обществе стало фундаментом для начало армянской шовинистической власти и привело к началу войны против Азербайджанской Республики.

В целом, американский подход коллективной безопасности, закрепленный в «Четырнадцати пунктах» Вильсона предусматривал, что на смену тайной дипломатии придут открытые договора (Stolkov, 2023, с.38). Распад СССР и начало Нагорно-Карабахского конфликта показало, что мировые державы не отказались от тайной дипломатии. Другой американский исследователь Г.Моргентау писал, что “борьбу за умы людей в качестве нового измерения международной политики следует добавить к международным измерениям дипломатии и войны” (Gadjiev, 2007, с.18). В эпоху постмодерна идеологии стали импортироваться и экспортироваться, как политические силы для насильственного изменения процесса общественного развития (5).

Иная политическая идеология, использованная в ходе процесса урегулирования Нагорно-Карабахского конфликта – «челночная дипломатия». Челночная дипломатия стала инструментом политического посредничества третьей стороны, которая стала популярна благодаря Генри Киссенджеру для выявления формулы разрешения арабо-израильского конфликта после войны Судного дня, при разработке соглашения между Израилем и Египтом о разъединении войск от 1974 года (Stolkov, 2023, с.41). Проблемы лидерства сегодня также актуальны на Южном Кавказе. Для внедрения своих интересов ведущие страны стали использовать транспортные коммуникации. На протяжении всей истории транспортные коммуникации играли особую роль в господстве контроля над торгово-экономическими путями и с целью обеспечения государственной безопасности. Поэтому несмотря на интенсивное развитие науки и техники в современный период, одним из значимых параметров остаётся фактор транспортных коммуникаций (Lavrentyev, 2024, с.55).

Падение СССР привело к активности определенных государств как в мире, так и на Южном Кавказе - Китай, Россия, Турция, ИРИ, Великобритания, США. Все перечисленные государства, имеющие в регионе свои политические и экономические интересы больше всех были заинтересованы в утверждении стабильности и добрососедства. За годы войны возможность открытия Зангезурского коридора стало дополнительным барьером в процессе мирных переговоров вокруг Нагорного Карабаха, так как это привело бы, к объединению тюркского мира, что было недопустимым фактором для стран-сопредседателей МГ ОБСЕ. Итогом 44-х дневной Отечественной войны стали попытки открытия Зангезурского коридора ускорения экономической интеграции. Но с другой стороны, процесс разблокирования Зангезурского коридора определяет очертания интересов США и России.

С одной стороны, для России выгодно открытие коридора с целью проявления собственных интересов. Для США же Зангезурский коридор, наоборот, будет означать усиление интересов России в регионе Южного Кавказа. Азербайджан же будет оказывать всевозрастающее влияние на регион, после открытия Зангезурского коридора. Азербайджан и Турция все эти годы расширяли свои отношения во всех сферах. Общность религии, культуры, языка, многовековых традиций привело к сильному притяжению двух стран, создав уникальные братские отношения, не имеющие аналогов на мировой политической авансцене на современном этапе (Aliyeva-Mamedova, 2021, с.109). В 90-ые гг. XX века КНР установил свои взоры на Южном Кавказе, чтобы заполнить вакуум, созданный на постсоветском пространстве. Реализация трех проектов, связанных с альтернативными маршрутами газопроводов – Набукко, Баку-Тбилиси-Эрзурум и Транс-черноморский трубопровод, – всегда зависели от стабильности на Южном Кавказе. Исходя из этого, ЕС всегда имеет веские причины для того, чтобы прилагать усилия ради стабильности на Южном Кавказе. Соответственно, географическая близость, наличие огромных энергоресурсов, газо- и нефтепроводы, проблемы, связанные с международной преступностью для стабильности в регионе - обеспечивают жизненно важные интересы ЕС (6).

## Заключение

Подписание Шушинской Декларации имеет особое значение, так как отражает всестороннее умение тюркских государств сотрудничать друг с другом, а также способствует установлению стабильности в регионе. Несмотря на то, что Декларация была подписана между Турецкой и Азербайджанской Республиками на уровне Президентов двух стран 15 июня 2021 года она стала призывом не только в регионе, но и далеко за её пределами. Проведённый анализ показывает, что установление стабильности в регионе Южного Кавказа должно привести к открытию Зангезурского коридора. Всё это, в свою очередь, будет ещё больше способствовать ускорению создания многополюсного мира.

Азербайджанская Республика, как итог дальновидной политики, контроля транспортных коммуникаций и энергоресурсов, становится государством, формирующим геополитику региона. В зависимости от этого, насколько глубоко силовые центры мира, в том числе и

армянская власть смогут оценить роль и усиление позиции Азербайджана будет зависеть характер процессов в Евразии.

**Литература**

1. Алиева-Мамедова, Г. (2021). Основные тренды внешней политики Турции в «Новой Большой игре». *Вестник Бакинского Государственного Университета*, №1, с.105-113.
2. Грибан, И.В., Кабыхно, Н.А. (2017). Конфликты в международных отношениях: современные аспекты изучения. *Вестник социально-гуманитарного образования и науки*, № 2. URL: https://journals.uspu.ru/attachments/article/1755/6.pdf
3. Гаджиев, К.С. (2007). Имидж государства в конфликте идеологий. URL: https://www.imemo.ru/files/File/ru/publ/2007/07003.pdf
4. Лаврентьев, А.В. (2024). Транспортные коммуникации как объект социальных исследований (краткий экскурс в методологию проблемы) // Теория и методология регионоведческих исследований. URL: https://ojkum.ru/images/articles/2016-3/_2016_3_0038-07.pdf (дата обращения – 30.07.2024)
5. Роль идеологии в современном мире. URL:https://russiancouncil.ru/analytics-and-comments/analytics/rol-ideologii-v-sovremennom-mire/?sphrase_id=114017148
6. Реальная и возможная роль ЕС в процессе разрешения Нагорно-Карабахского конфликта. URL:https://caucasusedition.net/ru
7. Столков, Д.С. (2023). Соотношение традиционных и новых инструментов дипломатии в продвижении национальных интересов Россиии (на примере деятельности фонда РОСКОНГРЕСС). URL: https://mgimo.ru/upload/diss/2023/stolkov-dissertacziya.pdf
8. Тешлек, В.И. Современные международные конфликты и подходы к их урегулированию. URL: https://cyberleninka.ru/article/n/sovremennye-mezhdunarodnye-konflikty-i-podhody-k-ih-uregulirovaniyu

Поступило: 24.11.2024
Принято: 05.03.2025

https://doi.org/10.36719/2789-6919/43/15-20

**Müjkan Məmmədzadə**
Hərbi Elmi Tədqiqat İnstitutu
pedaqogika üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0001-5693-3748
mujkan@mail.ru

# Azərbaycanda ali hərbi təhsilin inkişafının tarixi-pedaqoji tədqiqi

**Xülasə**

Məqalədə Azərbaycanda ali hərbi təhsilin tarixi inkişafı, onun əsas mərhələləri, pedaqoji yanaşmaları və beynəlxalq təcrübənin tətbiqi araşdırılır. Tarixi mənbələr və rəsmi sənədlər əsasında ali hərbi təhsilin inkişaf mərhələləri, SSRİ dövründə və müstəqillikdən sonra keçdiyi dəyişikliklər təhlil edilir. Məqalədə həmçinin, Azərbaycan ərazisində hərbi təhsilin ilkin formalarından bəhs olunmuşdu. Belə ki, erkən dövlət qurumlarının meydana gəlməsi ilə hərbi təlimlər sistemli şəkildə tətbiq olunmağa başlamışdır. Manna, Midiya və Atropatena kimi qədim dövlətlərdə döyüşçülərin hazırlanması xüsusi əhəmiyyət kəsb edirdi.

1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin (AXC) elan edilməsi ilə müstəqil dövlətin hərbi potensialını yaratmaq və gücləndirmək barədə əsas prioritetlər məqalədə öz əksini tapmışdır.

Azərbaycanın sovet hakimiyyətinə keçməsi ilə ölkədə hərbi təhsilin sovet modelinə uyğunlaşdırılması prosesinin başlanması, hərbi təhsil sisteminin təşkilində əsas məqsəd olaraq Qızıl Ordu sıralarına yerli kadrların cəlb edilməsi və onların ideoloji baxımdan sovet təbliğatı ilə yetişdirilməsi də məqalənin əsasını təşkil edir.

Azərbaycanın müstəqilliyini əldə etməsi ilə ölkənin özünəməxsus milli hərbi təhsil sisteminin formalaşdırılması vacib məsələ kimi qarşıya qoyuldu. 1991-ci ildə Azərbaycan Silahlı Qüvvələri yaradıldıqdan sonra hərbi kadrların hazırlanması üçün yeni modelin tətbiqinə başlanıldı.

***Açar sözlər:*** *ali hərbi təhsil, hərbi pedaqogika, zabit hazırlığı, ordu inkişafı, strateji idarəetmə*

**Mujkan Mammadzadeh**
Military Scientific Research Institute
PhD in pedagogy
https://orcid.org/0000-0001-5693-3748
mujkan@mail.ru

# Historical-Pedagogical Research of the Development of Higher Military Education in Azerbaijan

**Abstract**

The article examines the historical development of higher military education in Azerbaijan, its main stages, pedagogical approaches and the application of international experience. Based on historical sources and official documents, the stages of development of higher military education, the changes it underwent during the USSR and after independence are analyzed. The article also discussed the initial forms of military education in the territory of Azerbaijan. Thus, with the emergence of early state structures, military training began to be systematically applied. In ancient states such as Manna, Midia and Atropatena, the training of warriors was of particular importance.

With the proclamation of the Azerbaijan Democratic Republic (ADR) in 1918, the main priorities of creating and strengthening the military potential of an independent state were reflected in the article.

The beginning of the process of adapting military education in the country to the Soviet model with the transition of Azerbaijan to Soviet power, the main goal of organizing the military education

system, attracting local personnel to the ranks of the Red Army and their ideological training with Soviet propaganda, also form the basis of the article.

With the independence of Azerbaijan, the formation of a unique national military education system for the country was set as an important issue. After the establishment of the Azerbaijani Armed Forces in 1991, a new model for the training of military personnel began to be implemented.

***Keywords:*** *higher military education, military pedagogy, officer training, army development, strategic management*

## Giriş

Hər bir dövlətin hərbi qüdrətinin əsasını onun hərbi təhsil sistemi təşkil edir. Güclü və peşəkar zabit kadrları olmadan ordu effektiv fəaliyyət göstərə bilməz. Azərbaycanda hərbi təhsilin inkişafı uzunmüddətli bir proses olub, tarixi və siyasi dəyişikliklər fonunda formalaşıb.

Azərbaycanın ali hərbi təhsil sistemi keçmişdən bu günə qədər müxtəlif inkişaf mərhələlərindən keçmiş, milli ordu quruculuğunun və müdafiə sektorunun ayrılmaz tərkib hissəsi olmuşdur. Qədim dövrdən bu yana hərbi təhsilin inkişafı müxtəlif siyasi və tarixi faktorların təsiri altında dəyişikliklərə məruz qalmış, xüsusilə Sovet İttifaqı dövründə ciddi transformasiyaya uğramışdır.

Müstəqillik əldə edildikdən sonra isə Azərbaycan Respublikası özünün müasir ali hərbi təhsil sistemini formalaşdırmaq üçün genişmiqyaslı islahatlar həyata keçirmişdir. Hazırda Azərbaycanın ali hərbi təhsil sistemi beynəlxalq standartlara uyğun qurulmuş, hərbi akademiyalar, təhsil müəssisələri və xarici dövlətlərdə keçirilən tədris proqramları vasitəsilə təkmilləşdirilmişdir.

Aydındır ki, təhsil hər bir cəmiyyətin və dövlətin ayrılmaz atributlarından biridir. Dövlət və cəmiyyət təhsilsiz yaşaya bilməz. Azərbaycanın təhsil sisteminin milli təhlükəsizliyə bilavasitə necə töhfə verdiyinə dair bəzi konkret nümunələri qeyd etmək vacibdir. Ölkədə təhlükəsizlik sektorunda karyera qurmaq və xüsusi xidmət keçmək üçün insan resursları hazırlayan bir sıra ixtisaslaşmış xüsusi təyinatlı ali təhsil müəssisələri (ATM) var. Məsələn, Dövlət Təhlükəsizliyi Xidmətinin Akademiyası, Müdafiə Nazirliyinin Milli Müdafiə Universiteti, Dövlət Sərhəd Xidmətinin Akademiyası və Daxili İşlər Nazirliyinin Polis Akademiyası və digər bir sıra təhlükəsizlik, hərbi və hüquq-mühafizə qurumlarının xüsusi təyinatlı tədris müəssisələrində peşəkar kadrlar hazırlanır. Azərbaycan hökuməti terrorizmlə mübarizə və kibertəhlükəsizlik də daxil olmaqla bir sıra mövzularda təhlükəsizlik işçiləri üçün təlimlərin keçirilməsi və peşəkar xüsusi xidmət orqanları üçün kadr hazırlığı məqsədilə NATO ölkələri, xüsusilə qardaş Türkiyə ilə sıx əməkdaşlıq edir (Əhmədov, 2024).

**Tədqiqat**

Azərbaycan ərazisi tarixin müxtəlif dövrlərində strateji mövqeyinə və geosiyasi əhəmiyyətinə görə müxtəlif dövlətlərin maraq dairəsində olmuş, bunun nəticəsində ölkədə hərbi biliklərin öyrənilməsi və tətbiqi daim aktual olmuşdur. Qədim və orta əsrlərdə hərbi təhsil əsasən dövlətin müdafiəsini təşkil etmək, hərbi elitanı formalaşdırmaq və döyüş taktika və strategiyalarını təkmilləşdirmək məqsədilə inkişaf etdirilmişdir. Bu dövrlərdə hərbi təhsil formal şəkildə təşkil edilməsə də, fərdi təlim, saray məktəbləri və döyüş meydanlarında qazanan təcrübələr vasitəsilə ötürülürdü.

Azərbaycan ərazisində hərbi təhsilin ilkin formaları qədim dövrlərə gedib çıxır. Erkən dövlət qurumlarının meydana gəlməsi ilə hərbi təlimlər sistemli şəkildə tətbiq olunmağa başlamışdır. Manna, Midiya və Atropatena kimi qədim dövlətlərdə döyüşçülərin hazırlanması xüsusi əhəmiyyət kəsb edirdi. Bu dövlətlərdə hərbi elitanın yetişdirilməsi əsasən aristokrat ailələrinin oğullarının döyüş sənətinə yiyələnməsi ilə həyata keçirilirdi. Döyüşçülər oxatma, qılıncoynatma, süvari döyüş taktikaları və qalaların müdafiəsi üzrə təlimlər alırdılar.

Ərəb xilafəti dövründə Azərbaycanda hərbi təhsil əsasən islam hərbi ənənələri əsasında formalaşdı. Bu dövrdə döyüşçülər Quran və fiqh bilikləri ilə yanaşı, hərbi taktika və strategiyalara dair biliklər əldə edirdilər. Ərəb qoşunlarında xidmət edən azərbaycanlılar yürüşlər zamanı hərbi biliklər qazanır, həmçinin müsəlman dünyasının müxtəlif bölgələrində hərbi bacarıqlarını təkmilləşdirirdilər.

Səlcuqların Azərbaycanda hökmranlığı dövründə hərbi təhsil yeni bir mərhələyə qədəm qoydu. Bu dövrdə nizami ordu strukturu formalaşdı və hərbi məktəblər fəaliyyət göstərməyə başladı. Səlcuq sultanlarının sarayında və müxtəlif hərbi düşərgələrdə döyüşçülər xüsusi təlim keçirdilər. Oxçular,

süvarilər və piyadalar fərqli metodlarla təlim alırdılar. Bundan əlavə, saray məktəblərində gələcək sərkərdələr və dövlət xadimləri hərbi strategiya və idarəetmə sahəsində təhsil alırdılar.

Atabəylər dövründə hərbi təhsilin daha sistemli şəkildə inkişaf etdiyi müşahidə olunur. Şəmsəddin Eldəniz və onun davamçıları hərbi təlimi dövlətin əsas siyasətinə çevirdilər. Bu dövrdə gənc sərkərdələr xüsusi məktəblərdə yetişdirilir, döyüş bacarıqları və taktiki biliklər öyrədilirdi. Atabəylər ordusunda xüsusi döyüş sənətləri və mühasirə taktikaları geniş tətbiq olunurdu.

Qızıl Orda və Teymurilər dövründə Azərbaycanın hərbi sistemi dövrün yeni çağırışlarına uyğunlaşdırıldı. Bu dövrdə hərbi təhsil yalnız döyüş bacarıqları ilə məhdudlaşmır, həm də dövlət idarəçiliyi və diplomatiya sahəsində bilikləri özündə birləşdirirdi. Hərbi liderlər həm döyüş taktikalarını, həm də siyasi intriqaları mənimsəyir, döyüş meydanında olduğu kimi, siyasi səhnədə də uğur qazanmağa çalışırdılar.

Səfəvilər dövrü Azərbaycanda hərbi təhsilin yeni inkişaf mərhələsi oldu. Səfəvilər dövründə nizami ordu formalaşdırıldı və "Qızılbaş" döyüşçüləri xüsusi təlimlər keçirdilər. Hərbi təlimlər süvari və piyada qoşunlarının döyüş bacarıqlarını təkmilləşdirmək məqsədi daşıyırdı. Bu dövrdə hərbi məktəblər formal şəkildə olmasa da, dövlət daxilində müəyyən hərbi biliklərin ötürülməsi prosesi daha sistemli hala gətirildi. Səfəvilər dövründə döyüşçülər Osmanlı və Avropa dövlətlərinin hərbi strategiyalarını öyrənir və onların müharibə texnikalarından istifadə edirdilər.

Qacarlar dövründə hərbi təhsilin yeni formaları meydana çıxdı. Bu dövrdə hərbi texnika və odlu silahların tətbiqi ilə əlaqədar olaraq döyüşçülərin hazırlanması müasir sistemə uyğunlaşdırıldı. Qacar sülaləsinin idarəçiliyi dövründə Avropa ölkələri ilə hərbi əlaqələr artdı və bir sıra Azərbaycanlı zabitlər xarici ölkələrdə təhsil almağa göndərildi (Cəfərov, 2010).

Nəticə etibarilə, qədim və orta əsrlərdə Azərbaycanda hərbi təhsil fərqli formalarda mövcud olmuş və dövrün tələblərinə uyğun şəkildə inkişaf etmişdir. Dövlətin hərbi qüdrətini qorumaq məqsədilə müxtəlif təlim metodları tətbiq olunmuş, gələcək sərkərdələr və döyüşçülər fərdi və kollektiv şəkildə hərbi biliklərə yiyələnmişlər. Bu dövrdə formal hərbi məktəblər olmasa da, saray təhsili, döyüş meydanında qazanan təcrübələr və xarici təsirlər hərbi təhsilin əsasını təşkil etmişdir. Azərbaycanda qədim və orta əsrlərdə hərbi təhsil gələcək əsrlərdə formalaşacaq nizami hərbi sistemlər üçün zəmin yaratmış və hərbi ənənələrin inkişafına mühüm təsir göstərmişdir.

Azərbaycan Xalq Cümhuriyyəti dönəmində hərbi təhsil. XX əsrin əvvəllərində Azərbaycanda milli hərbi təhsilin inkişafı mühüm tarixi proseslərin təsiri altında formalaşmışdır. 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyətinin (AXC) elan edilməsi ilə müstəqil dövlətin hərbi potensialını yaratmaq və gücləndirmək əsas prioritetlərdən biri oldu. Dövlətin suverenliyinin qorunması üçün müstəqil ordu quruculuğuna xüsusi diqqət yetirildi və bu proses çərçivəsində milli zabit kadrlarının hazırlanması zərurətə çevrildi. AXC dövründə hərbi təhsil sisteminin təşkili və inkişaf etdirilməsi bu sahədə atılan ilk sistemli addımlardan biri idi.

Azərbaycan Xalq Cümhuriyyəti elan edildiyi zaman ölkənin nizami ordusu yox idi və hərbi sahədə peşəkar kadr çatışmazlığı mövcud idi. Bunun əsas səbəblərindən biri, çar Rusiyası dövründə azərbaycanlıların hərbi sahədə yüksək vəzifələrə irəli çəkilməsinə məhdudiyyətlərin qoyulması idi. Azərbaycanlı zabitlər əsasən Rusiya imperiyasının müxtəlif hərbi məktəblərində təhsil almış və imperiya ordusunda xidmət etmişdilər. Lakin AXC hökuməti müstəqil ordu yaratmaq üçün yerli hərbi kadrların hazırlanmasını vacib hesab edirdi. Bu məqsədlə 1918-ci ilin iyun ayında Azərbaycanın ilk hərbi qurumu - Müdafiə Nazirliyi təsis edildi. Nazirliyin əsas fəaliyyət istiqamətlərindən biri hərbi təhsilin təşkili və milli zabit korpusunun formalaşdırılması oldu (Azərbaycan Respublikası Müdafiə Nazirliyi, 2022).

Azərbaycan Xalq Cümhuriyyəti dövründə hərbi təhsil sahəsində ilk mühüm addımlardan biri 1918-ci ilin noyabrında Gəncədə hərbi məktəbin yaradılması oldu. Bu məktəbin əsas məqsədi ordunun komanda heyətini milli kadrlarla təmin etmək idi. Hərbi məktəbin açılmasında və təşkilati məsələlərin həllində general-qubernator Səməd bəy Mehmandarov və general Əliağa Şıxlinski mühüm rol oynadılar. Bu məktəb qısa müddət ərzində fəaliyyət göstərsə də, AXC-nin süqutuna qədər zabit kadrlarının hazırlanmasında əhəmiyyətli rol oynadı.

Milli hərbi təhsil sisteminin gücləndirilməsi məqsədilə xarici ölkələrlə əməkdaşlıq qurulmağa başlanıldı. 1919-cu ildə Azərbaycan Xalq Cümhuriyyəti hökuməti bir qrup azərbaycanlı gənci hərbi

təhsil almaq üçün Türkiyə və Avropa ölkələrinə göndərdi. Bu təşəbbüs, AXC hökumətinin gələcəkdə müstəqil hərbi elitanın formalaşdırılmasına dair uzaqgörən siyasətinin göstəricisi idi. Eyni zamanda, Osmanlı dövlətindən gələn hərbi mütəxəssislər Azərbaycan ordusunun qurulmasında və hərbi tədris prosesində mühüm rol oynadılar. Nuru Paşanın rəhbərliyi ilə Qafqaz İslam Ordusu Azərbaycanda milli ordunun təşkili üçün hərbi kadrların hazırlanmasına dəstək verdi.

AXC dövründə hərbi təhsilin inkişaf etdirilməsinə və ordunun gücləndirilməsinə baxmayaraq, mövcud çətinliklər və maddi-texniki çatışmazlıqlar bu prosesin tam reallaşmasına mane oldu. Azərbaycan Xalq Cümhuriyyəti cəmi 23 ay mövcud olduğu üçün genişmiqyaslı hərbi təhsil proqramlarının həyata keçirilməsi mümkün olmadı. 1920-ci ilin aprel ayında bolşeviklərin Bakını işğal etməsi ilə AXC-nin ordu quruculuğu və hərbi təhsil siyasəti yarımçıq qaldı. Lakin bu dövrdə əsası qoyulan hərbi təhsil ənənələri sonrakı illərdə Azərbaycanın hərbi sisteminin inkişafına təsir göstərdi (Məmmədov, 2012).

Azərbaycan Xalq Cümhuriyyəti dövründə hərbi təhsilin təşkili və milli zabit kadrlarının hazırlanması istiqamətində həyata keçirilən addımlar müstəqil dövlətin hərbi təhlükəsizliyinin təmin olunması yolunda mühüm mərhələ idi. Bu proses, qısa müddət ərzində həyata keçirilməsinə baxmayaraq, Azərbaycan tarixində ilk müstəqil hərbi təhsil sisteminin qurulmasına və gələcək nəsillər üçün milli zabit ənənələrinin formalaşmasına təkan verdi. AXC-nin süqutundan sonra bu istiqamətdə aparılan işlər dayandırılsa da, sovet dövründə və müstəqillikdən sonra Azərbaycanın hərbi təhsil sistemi bu təməllər üzərində inkişaf etdirildi.

Sovet dövründə Azərbaycanda hərbi təhsil. 1920-ci ilin aprel ayında Azərbaycan Xalq Cümhuriyyətinin süqutundan sonra bolşevik hakimiyyəti ölkədə sovet hərbi sistemini tətbiq etməyə başladı. Yeni qurulan Sovet Sosialist Respublikası daxilində Azərbaycanda hərbi təhsil sistemi SSRİ-nin ümumi hərbi siyasətinə uyğun şəkildə formalaşdırıldı. Sovet hökumətinin əsas məqsədi Qızıl Ordunun tərkibində xidmət edəcək yerli hərbi kadrların hazırlanması və Azərbaycanın müdafiə potensialının SSRİ-nin maraqlarına uyğun istiqamətləndirilməsi idi (Əliyev, 2001).

Azərbaycanın sovet hakimiyyətinə keçməsi ilə ölkədə hərbi təhsilin sovet modelinə uyğunlaşdırılması prosesi başladı. İlk illərdə hərbi təhsil sisteminin təşkilində əsas məqsəd Qızıl Ordu sıralarına yerli kadrların cəlb edilməsi və onların ideoloji baxımdan sovet təbliğatı ilə yetişdirilməsi oldu. 1921-ci ildə Bakıda hərbi məktəb yaradıldı və bu məktəb gələcəkdə milli kadrların formalaşmasında mühüm rol oynadı.

1920-1930-cu illər ərzində Azərbaycanda hərbi təhsil əsasən SSRİ-nin müxtəlif şəhərlərində yerləşən ali hərbi məktəblərə azərbaycanlı gənclərin göndərilməsi yolu ilə həyata keçirilirdi. Bakı, Leninqrad (indiki Sankt-Peterburq), Moskva və digər şəhərlərdə yerləşən hərbi akademiyalara göndərilən azərbaycanlı zabitlər burada sovet ordusunun taktika və strategiyalarını mənimsəyirdilər. Bu dövrdə Azərbaycan gəncləri əsasən komandanlıq, mühəndislik, artilleriya və aviasiya sahələrində təhsil alırdılar.

1939-1945-ci illərdə İkinci Dünya Müharibəsi zamanı Azərbaycanda hərbi təhsil sürətlə inkişaf etdi. Müharibənin başlanması ilə orduya daha çox peşəkar kadr hazırlamaq məqsədilə hərbi məktəblərin fəaliyyəti genişləndirildi. Azərbaycan gəncləri müxtəlif hərbi akademiyalarda təhsil alaraq cəbhəyə göndərildilər. Müharibə dövründə Bakıda və digər şəhərlərdə sürətləndirilmiş hərbi kurslar təşkil olundu, burada əsasən piyada qoşunları, tankçılar və topçular üçün hazırlıq kursları keçirilirdi.

Müharibədən sonra, 1945-ci ildən etibarən sovet hakimiyyəti hərbi təhsilin daha da sistemləşdirilməsinə diqqət yetirdi. Azərbaycanda hərbi təhsilin ən mühüm inkişaf mərhələsi 1971-ci ildə Bakı Ali Birləşmiş Komandirlər Məktəbinin (BABKM) yaradılması ilə başladı. BABKM-in əsas məqsədi sovet ordusu üçün peşəkar zabitlərin hazırlanması idi. Məktəb sovet hərbi təhsil sisteminə tam inteqrasiya olunmuşdu və burada tədris SSRİ-nin digər hərbi akademiyalarında olduğu kimi yüksək səviyyədə təşkil edilirdi.

BABKM-də təhsil alan azərbaycanlı zabitlər Sovet İttifaqının müxtəlif hərbi hissələrində xidmət edirdilər. Məktəbdə hərbi taktika, strateji idarəetmə, mühəndislik və rabitə kimi sahələr üzrə ixtisaslaşmış kurslar keçirilirdi. Burada təhsil alan tələbələr SSRİ Müdafiə Nazirliyinin tabeçiliyində fəaliyyət göstərən digər ali hərbi məktəblərlə sıx əlaqədə idilər.

1970-1980-ci illər ərzində Azərbaycanda hərbi təhsil SSRİ-nin hərbi-siyasi strategiyasına uyğun şəkildə inkişaf etdirildi. Sovet ordusunun tərkibində xidmət edən azərbaycanlı zabitlər SSRİ-nin müxtəlif bölgələrində hərbi əməliyyatlarda iştirak edirdilər. Onların bir qismi Əfqanıstan müharibəsinə (1979-1989) cəlb olundu və burada qazandıqları döyüş təcrübəsi sonradan Azərbaycanın müstəqillik dövründə ordu quruculuğu prosesinə təsir göstərdi.

Sovet dövründə Azərbaycanda hərbi təhsilin əsas xüsusiyyətlərindən biri onun ideoloji istiqamətləndirilməsi idi. Hərbi təhsil alan şəxslər sovet ideologiyasına uyğun yetişdirilir və onların siyasi baxışları sosialist rejimin tələblərinə uyğun formalaşdırılırdı. Hərbi akademiyalarda və məktəblərdə marksizm-leninizm tədris olunurdu və zabitlərin siyasi dünyagörüşü ciddi nəzarət altında saxlanılırdı (Əliyev, 2003).

SSRİ-nin son illərində, 1980-ci illərin ikinci yarısında, hərbi təhsil sistemində müəyyən dəyişikliklər baş verdi. Sovet İttifaqının daxili siyasi və iqtisadi problemləri hərbi təhsil sahəsinə də təsir etdi. 1991-ci ildə SSRİ-nin süqutu ilə Azərbaycanın hərbi təhsil sistemi də yeni bir mərhələyə qədəm qoydu. Sovet hərbi məktəblərində yetişən azərbaycanlı zabitlər müstəqil Azərbaycanın ordusunun qurulmasında mühüm rol oynadılar.

Sovet dövründə Azərbaycanda hərbi təhsil əsasən SSRİ-nin vahid hərbi strategiyasına uyğun təşkil edilmişdi. Azərbaycanlı zabitlər SSRİ ordusunun müxtəlif bölmələrində xidmət edərək mühüm təcrübə qazandılar. Bu dövrdə yaradılmış hərbi təhsil infrastrukturu və kadr potensialı sonradan müstəqil Azərbaycanın ordu quruculuğunda mühüm rol oynadı.

Müstəqillik dövründə hərbi təhsilin yenidən qurulması. 1991-ci ildə Azərbaycan müstəqilliyini bərpa etdikdən sonra ölkənin təhlükəsizliyinin və suverenliyinin təmin edilməsi üçün milli ordunun yaradılması əsas prioritetlərdən birinə çevrildi. Sovet İttifaqının dağılması ilə Azərbaycanda mövcud olan hərbi təhsil sistemi köhnəlmiş və yeni qurulan ordu üçün müasir tələblərə cavab verən hərbi kadr hazırlığı zərurətə çevrilmişdi. Hərbi təhsilin yenidən qurulması və müasir standartlara uyğunlaşdırılması məqsədilə sistemli islahatlara başlanıldı.

Azərbaycanın müstəqilliyini əldə etməsi ilə ölkənin özünəməxsus milli hərbi təhsil sisteminin formalaşdırılması vacib məsələ kimi qarşıya qoyuldu. 1991-ci ildə Azərbaycan Silahlı Qüvvələri yaradıldıqdan sonra hərbi kadrların hazırlanması üçün yeni modelin tətbiqinə başlanıldı. Müstəqilliyin ilk illərində hərbi təhsil sahəsində əsas problemlərdən biri peşəkar hərbçi kadrlarının çatışmazlığı idi. SSRİ dövründə azərbaycanlı zabitlər əsasən sovet hərbi məktəblərində təhsil alırdılar və müstəqillikdən sonra onların böyük bir qismi ya Rusiyaya qayıtdı, ya da yeni milli orduya qoşulmadı.

Müstəqilliyin ilk illərində hərbi təhsilin təşkilində əsas problemlərdən biri maddi-texniki bazanın zəif olması və kadr çatışmazlığı idi. Bu problemləri həll etmək üçün 1992-ci ildə Azərbaycan Respublikası Silahlı Qüvvələrinin ilk hərbi təhsil müəssisəsi olan Azərbaycan Ali Hərbi Məktəbi təsis edildi. Bu məktəbin əsas məqsədi müstəqil Azərbaycanın ordusu üçün milli zabit kadrları hazırlamaq idi. Heydər Əliyevin hakimiyyətə qayıdışından sonra 1993-cü ildən etibarən Azərbaycanda hərbi təhsil sistemində islahatlar daha geniş vüsət aldı. Onun rəhbərliyi ilə ölkənin hərbi doktrinası yenidən işlənildi və hərbi təhsilin modernləşdirilməsi istiqamətində konkret addımlar atıldı. 1997-ci ildə Azərbaycan Ali Hərbi Məktəbinin adı dəyişdirilərək Heydər Əliyev adına Azərbaycan Ali Hərbi Məktəbi adlandırıldı. Bu məktəb Azərbaycanın əsas hərbi təhsil müəssisəsinə çevrildi və burada quru qoşunları, hava qüvvələri və dəniz qüvvələri üçün peşəkar zabitlərin hazırlanmasına başlanıldı (Hacıyev, 2015).

Azərbaycanın hərbi təhsil sisteminin inkişafında xarici ölkələrlə əməkdaşlıq mühüm rol oynadı. 1990-cı illərdən etibarən Türkiyə, ABŞ və NATO çərçivəsində bir sıra Avropa ölkələri ilə hərbi təhsil sahəsində əməkdaşlıq əlaqələri quruldu. Xüsusilə, Türkiyə ilə hərbi təhsil sahəsində sıx əməkdaşlıq aparıldı və bir çox azərbaycanlı zabitlər Türkiyənin hərbi akademiyalarında təhsil almağa göndərildi. Bu əməkdaşlıq nəticəsində Azərbaycanın hərbi təhsil sistemi NATO standartlarına uyğunlaşdırıldı və ordunun peşəkarlıq səviyyəsi artırıldı (Quliyev, 2019).

2000-ci illərdə hərbi təhsilin təkmilləşdirilməsi istiqamətində yeni islahatlar həyata keçirildi. 2001-ci ildə Naxçıvan şəhərində Heydər Əliyev adına Hərbi Lisey təsis edildi. Bu lisey gənc kadrların hərbi sahəyə marağını artırmaq və onları peşəkar zabit kimi yetişdirmək məqsədi daşıyırdı. Bununla

yanaşı, Azərbaycan Milli Müdafiə Universitetinin yaradılması istiqamətində hazırlıqlar aparılmağa başlandı və bu sahədə genişmiqyaslı islahatlar davam etdirildi.

Azərbaycanın hərbi təhsil sistemində yenidənqurma işləri yalnız daxili islahatlarla məhdudlaşmadı, eyni zamanda beynəlxalq təcrübə və müasir texnologiyalar tətbiq edilməyə başlandı. Azərbaycan Silahlı Qüvvələri NATO proqramlarında iştirak edərək hərbi təhsil sahəsində yeni metodologiyaları mənimsədi. 2013-cü ildə Müdafiə Nazirliyinin nəzdində Silahlı Qüvvələrin Hərbi Akademiyası təsis edildi. Bu akademiya ali hərbi təhsil verən ən önəmli qurumlardan biri oldu və burada zabitlər üçün müasir hərbi strategiya və idarəetmə sahəsində tədris aparıldı (https://mod.gov.az/az/azerbaycan-ordusunun-herbi-elm-ve-tehsil-sistemi-326/).

Azərbaycanın 2020-ci ildə Vətən müharibəsində qazandığı qələbə hərbi təhsil sisteminin uğurlu yenidənqurma prosesindən keçdiyini sübut etdi. Müharibə zamanı Azərbaycan ordusunun tətbiq etdiyi müasir döyüş taktikaları və yüksək hazırlıqlı zabit korpusu hərbi təhsilin beynəlxalq standartlara uyğun qurulmasının vacibliyini bir daha göstərdi. Bu uğurun əldə olunmasında Türkiyə, Pakistan və NATO ilə həyata keçirilən birgə təlimlərin və xaricdə təhsil almış zabitlərin böyük rolu oldu.

## Nəticə

Müstəqillik dövründə Azərbaycanda hərbi təhsilin yenidən qurulması ölkənin təhlükəsizliyinin və müdafiə qabiliyyətinin gücləndirilməsi baxımından mühüm rol oynamışdır. 1990-cı illərdən etibarən həyata keçirilən islahatlar nəticəsində müasir hərbi təhsil sistemi formalaşdırılmış və Azərbaycan ordusunun peşəkarlıq səviyyəsi artırılmışdır. Xarici ölkələrlə əməkdaşlıq, yeni hərbi təhsil müəssisələrinin yaradılması və müasir texnologiyaların tətbiqi nəticəsində Azərbaycanın hərbi təhsili yüksək standartlara uyğunlaşdırılmışdır. Bugünkü hərbi təhsil sistemi Azərbaycanın müdafiə strategiyasının ayrılmaz hissəsinə çevrilmiş və ölkənin hərbi gücünün əsas dayaqlarından biri olmuşdur.

Hazırda Azərbaycanda hərbi təhsil sistemi modernləşdirilməkdə davam edir. Azərbaycan Respublikası Prezidentinin 2022-ci ildə imzaladığı sərəncamla Müdafiə Nazirliyinin nəzdində Milli Müdafiə Universiteti təsis edildi. Bu universitet Azərbaycanda hərbi təhsil sisteminin daha yüksək səviyyəyə qaldırılması və gələcəkdə peşəkar hərbi kadrların daha genişmiqyaslı hazırlanmasına xidmət edəcək.

## Ədəbiyyat

1. Azərbaycan Respublikası Müdafiə Nazirliyi (2022). *Azərbaycan Ordusunun inkişaf konsepsiyası*. Müdafiə Nazirliyi
2. Cəfərov, Y. (2010). *Azərbaycan Silahlı Qüvvələri: Tarixi İnkişaf Yolu*. “Nurlan” nəşriyyatı.
3. Əhmədov, H. (2024). Azərbaycanın təhsil sistemi milli təhlükəsizlik kontekstində. https://525.az/news/259625-azerbaycanin-tehsil-sistemi-milli-tehlukesizlik-kontekstinde
4. Əliyev, H. (2001). *Azərbaycanın hərbi strategiyası*. Azərbaycan.
5. Əliyev, H. (2003). *Ordu və Dövlətçilik.* Şərq-Qərb.
6. Hacıyev, R. (2015). *Müasir hərbi təhsil və onun inkişaf perspektivləri*. Elm və Təhsil.
7. Quliyev, Ə. (2019). *Ali hərbi təhsildə innovasiyalar*. Təhsil.
8. Məmmədov, T. (2012). *Azərbaycan Xalq Cümhuriyyətinin hərbi siyasəti*. Şərq-Qərb.
9. https://mod.gov.az/az/azerbaycan-ordusunun-herbi-elm-ve-tehsil-sistemi-326/

Daxil oldu: 05.12.2024
Qəbul edildi: 16.03.2025

https://doi.org/10.36719/2789-6919/43/21-25

**Xankişi Məmmədov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
texnika üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0006-6978-3084
kankishimamedov_53@mail.ru
**Əsbət Teymurova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0009-0002-4094-5108
esmet.abdullayeva@mail.ru

# Mətbəxlə bağlı bəzi frazeoloji ifadələrin harmoniyası

**Xülasə**

Bu araşdırmada açarı dəqiq məlum olmayan bəzi frazeoloji ifadələrin doğru və yanlış, məlum və ya qeyri məlum variantları araşdırılır. Belə ifadələrdən biri "Əvvəl təam, sonra kəlam" məsəlidir. Yazıda bir çox anlayışların, o cümlədən "kəlam", "alim", "tərif", "nöqtə" və başqa anlayışların tərifi verilməklə, onların görünməyən üzlərindən də söhbət açılır. Araşdırılan ifadələrdən biri də "Ağın adı var, qaranın dadı" məsəlidir. Qeyd edilir ki, deyimdəki "ağ" leksemi rəngi yox, düyünü ifadə edir. Çünki, rəngi ağ olduğuna görə düyüyə bəzən "ağ" deyirlər. "Qara" isə ətdən, kişmişdən, şabalıddan, ərikdən və digər ərzaqlardan düşəldilən və plovun üstünə qoyulan yeməkdir. Düyü sözünün etimalogiyası ilə qeydlər də maraq kəsb edir. *Belə ki, "düyü"* sözünün "oruza" latın sözündən əmələ gəldiyi və bu sözün "oruza", "əruzza", "ərrüz" sözləri ilə qohum sözlər olduğu və düyünün çəki vahidinin "əruzza" olduğu qeyd edilir. Tədqiqatda həmçinin "Məsləhətli aş dadlı olar", "Aşbaz çox olanda xörək ya şit olar, ya şor", Xəmiraşı – bəylər aşı və bir çox atalar sözlərinin və el deyimlərinin asanca gözə görünməyən fəlsəfəsinə diqqət ayrılmış, milli-mənəvi köklərimizi, adət-ənənlərimizi, mədəniyyətimizi, milli psixologiyamızı və mentalitetimizi əks etdirən və işləkliyi kifayət qədər yüksək olan bir çox el deyimlərinin müasir düşüncə prizmasından nə qədər maraq kəsb etdiyi göstərilmişdir.

***Açar sözlər:*** *frazeoloji ifadələr, mətbəx, tərif, təam, kəlam, ağ, qara*

**Khankishi Mammadov**
Azerbaijan State Pedagogical University
PhD in technology
https://orcid.org/0009-0006-6978-3084
kankishimamedov_53@mail.ru
**Asbat Teymurova**
Azerbaijan State Pedagogical University
https://orcid.org/0009-0002-4094-5108
esmet.abdullayeva@mail.ru

# Harmony of Some Phraseological Expressions Related to Cuisine

**Abstract**

This study examines the correct and incorrect, known and unknown variants of some phraseological expressions, the tone of which is not exactly known. One such expression is the proverb "First food, then speech". The article defines many words, including the word "kalam", the science of "kalam", "scientist", "definition", "point" and other concepts, and examines their unseen sides. One of the studied expressions is the proverb "White has a name, black has a taste". It is noted that the lexeme "white" in the idiom denotes rice, not color. Because rice is sometimes called "white" because of its white color.

"Kara" is a dish made of meat, raisins, chestnuts, apricots and otheringredients and served over pilaf. Notes on the etymology of the word "rice" are also interesting. For example, it is noted that the word "rice" came from the Latin word "oruza" and that the word is related to the words "oruza", "eruzza" and "erruz" and that the unit of weight of rice is "eruzza". The study also focused on the philosophy of "Food with advice is delicious", "When cooks are many, food is either dry or salty", "Hamirashi - beylar ashi" and many other proverbs and folk sayings that are not easily seen with the naked eye and showed how interesting from the prism of modern thinking many folk sayings are, reflecting our national-spiritual roots, customs, culture, national psychology and mentality and having quite high functionality.

***Keywords:*** *phraseological expressions, kitchen, definition, food, word, white, black*

## Giriş

Yunan sözü olan harmoniya əksər mənbələrdə musiqi termini kimi qeyd edilsə də, məişətdə də mütləqdir. Amma məsələyə məntiqi cəhətcə yanşsaq, bu fikrin bir qədər yanlış olduğunu görə bilərik. Bunun üçün məişət məfhumunun ("məişət" də, "məfhum" da hər ikisi ərəb sözüdür) tərifinə diqqət etmək kifayət edər. Məişət – insanın və cəmiyyətin inkişafının müasir səviyyəsi, insanın yaratdığı və nəsildən-nəsilə ötürdüyü maddi və mənəvi dəyərlər, başqa sözlə, ümumi yaşayış tərzidir. Musiqi də maddi və mənəvi dəyərlər qrupuna aid olduğu üçün, onda belə nəticə çıxartmaq olar ki, "harmoniya" əslində məişət terminidir. Hər halda "məişət" sözünün fəlsəfəsi bu fikri söyləməyə və belə nəticə çıxartmağa imkan verir. Riyazi dildə bunu belə demək olar: Harmoniya məişətin alt çoxluğuna daxildir. Qeyd edək ki, incəsənətin gündəlik şəxsi və ictimai həyata həsr olunmuş "məişət" janrı da var. Ümumiyyətlə, dünyanın yaranışı harmoniyadan başladığı kimi, frazeoloji ifadələr də harmoniya üzərində yaranıb. Deməli frazeoloji ifadələr varsa, orada harmoniya var. Bu yazıda bir çox el məsəllərinin bir-biri ilə vəhdəti və bağlılığı, yəni harmoniyası tədqiqata cəlb edilmiş, mətbəxlə bağlı bir çox ifadələrin yanlış və doğru variantları araşdırılmışdır.

**Tədqiqat**

Qeyd edək ki, dünya dillərində frazeoloji vahidləri tədqiq edən müəlliflər müxtəlif cür düşünürlər və biz bunu təbii qəbul edirik. Məsələn, ingilis dili tədqiqatçısı N.Amosova atalar sözlərini "predikativ quruluşlu frazeoloji vahidlər", A.Kunin "predikativ frazeologizmlər" kimi adlandırırlar (Mustafayev, Məmmədov, 2008). V.Vinoqradov və onun ardıcılları atalar sözləri və məsəllərini frazeoloji birləşmələrlə birlikdə tədqiq etməyi lazım bilirlər. Azərbaycan dilində də bu sahədə müxtəlif cür yanaşmalar mövcuddur. Bütün deyilənlərdən belə nəticə hasil olur ki, "frazeologiya" anlayışı haqqında dəqiq fikir söyləmək çətin olsa da, bir şey dəqiqdir ki, "frazeologiya" deyəndə, buraya yalnız mənası komponentlərinin mənasından asılı olmayan parçalanmaz leksik birləşmələr deyil, digər sabit birləşmələr, məsələn, atalar sözləri, hətta aforizmlər də daxildir.

Əvvəlcə məişətdə tez-tez rast gəldiyimiz "Əvvəl təam, sonra kəlam" məsəlinə nəzər yetirək. Bu başdan qeyd edək ki, bütün atalar sözləri kitablarında və Oğuznamədə rast gəlinən bu deyim el məsəlinin doğru variantıdır, yəni orijinalıdır. Bu kəlamın "Əvvəl gödəniyyət, sonra mədəniyyət" variantı isə el arasında işlənən yanlış variantdır. Bu deyimi hamı bildiyindən və ümumiyyətlə, bizim xalqa yaraşmayan bir ifadə olduğuna görə, ona vaxt ayırmağa ehtiyac duymadıq. Qeyd edək ki, adı çəkilən atalar sözündəki "təam və ya taam" sözü ərəb sözü olub, mənası "xörək, yemək, bişmiş" deməkdir. Məsələn, deyirik ki, "gedək təam edək", yəni "gedək yemək yeyək". Deyimdəki "kəlam" sözü də ərəb sözüdür, mənası "söz", "kəlmə", "ifadə", "nitq", "danışıq" deməkdir. Kəlam haqqında atalar sözümüz də var: "Kamil insan kəlamından bəlli olar". "Kəlam" elminin olmağı da elmə məlumdur. Doğrudur, bəzən Kəlam elmini Fəlsəfə ilə qarışdıranlar da var. Amma bunlar müəyyən məqamlarda bir-birinə oxşasalar da, bir-birindən xeyli fərqlənirlər. Bu fərqi görənlərə isə alim deyilir. Deməli, iki tamamilə eyni və ya iki tamamilə oxşar şeylər arasında olan fərqi görən adamlara alim deyilir. Əslində bu tərifə X.Məmmədovun əlavə etdiyi digər fikirləri də nəzərə alsaq, alimin tərifini belə vermək olar: İki tamamilə eyni şey arasında olan fərqi və ya iki tamamilə müxtəlif şeylər arasında olan oxşarlığı görən adamlara alim deyilir (X.M.). Bu barədə X.Məmmədovun yaxın zamanlarda işıq üzü görəcək "Fəlsəfənin fəlsəfəsi" kitabında tanış olmaq olar. Bu yerdə istərdik ki, "tərif"in də tərifin deyək ki, bəlkə bilməyənlər üçün maraqlı olar. Axı hər şeyin tərifi var. Tərifin

tərifi: "Hər hansı bir adın və ya ifadənin mənasını izah edən təkliflərə tərif deyilir". Yəqin ki, riyaziyyat fənnindən gələcəkdə dərslik və ya dərs vəsaiti yazan müəlliflər bunu nəzərə alarlar. Mətləbdən uzaqlaşmamaq üçün fikirlərimizə balaca bir nöqtə qoyub, bilavasitə mövzu ilə söhbətimizə körpü (qədim zamanlarda körpü tikənlərə mühəndis deyirdilər. Mühəndis sözü ilk dəfə XVI əsrdə Hollandiyada meydana gəlib) salmaq istəyirik. Ona görə "balaca" ifadəsini işlədirik ki, nöqtənin də balacası və yekəsi olur. Amma çox adam bilmir ki, əslində "nöqtə" özü ölçü vahididir, özü də uzunluq ölçü vahidi. Yeri gəlmişkən, ölçü vahidləri ilə bağlı X.Məmmədov və S.Musayevanın məqalələrində də bu barədə maraqlı məqamlarla tanış olmaq olar (Məmmədov, Musayeva, 2024, s.26-29), (Məmmədov, Musayeva, 2024, s.23-27). Bəs bir "nöqtə" nəyə bərabərdir? Bu barədə növbəti yazılarımızda. Araşdırdığımız növbəti el deyiminə diqqət edək: "Ağın adı var, qaranın dadı". Onu da qeyd edək ki, "ana rəng" və ya "Tanrı rəngi" (ona görə belə adlanır ki, digər rənglərdən ağ rəng almaq mümkün olmadığı halda, ağ rəngdən istənilən rəngi almaq, yaratmaq mümkündür. Axı yaratmaq yalnız Allaha məxsusdur.) kimi tanıdığımız "ağ" rəngdən bəzilərinin, məsələn, pessimistlərin yəni pis düşünən adamların, başqa sözlə bədbin adamların və skeptiklərin, yəni *hər şeyə inamsız və ümidsiz yanaşan və* hər şeydən şübhələnən adamların xoşu gəlmir. "Ağ" sözünün bir mənası da "böyük" deməkdir. Ana kitabımız olan "Kitabi-Dədə Qorqud"da da "ağ" sözünə çox rast gəlinir. Məsələn, dastandakı "Ağ meydan" ifadəsi "böyük meydan" mənasında işlənir. Bununla belə, "ağ" rəngin mənfi çalarları da istisna deyil. Dilimizdə işləkliyi kifayət qədər yüksək olan "ağ yalan", "ağ böhtan", "ağ şər" ifadələrində "ağ" yalanın, böhtanın, şərin şişirtmə dərəcəsini göstərməklə mənfi əlamət bildirir. Qurani-Kərimin Hud surəsinin 6-cı ayəsində göstərilir ki, yalanı ancaq Allahın ayələrinə inanmayanlar uydururlar, onlar əsl yalançılardır. "Üzün ağ olsun, yaxşı üzümü ağ elədin" deyimindəki "ağ" da əslində mənfi anlamda işlənir (Məmmədov, 2022, s.252).

"Ağın adı var, qaranın dadı" deyimindən doğrudan da ilk halda belə anlaşılır ki, guya ağ rəngin elə adı var, qara rəng ağdan yaxşıdır. Amma məsələ bizim çoxlarımızın düşündüyü kimi deyil. Məsələ burasındadır ki, deyimdəki "ağ" leksemi rəngi yox, düyünü ifadə edir. Düyünün rəngi ağ olduğuna görə bəzən ona "ağ" deyirlər. Amma başqa rənglərdə də, məsələn, qırmızı, qara, qəhvəyi və başqa rəngdə də düyü növləri var ki, onlar ağ düyü ilə müqayisədə bütün yeməklərin hazırlanmasında istifadə olunmur. Bir faktı da qeyd edək ki, qardaş Türkiyədə "Ağın" adlı rayon da var. Qovrulmuş noxudları ilə məşhur olan Ağın Elazığ vilayətinin 11 rayonundan ən kiçiyi olmaqla vilayətin şimal-qərbində yerləşir və şəhər mərkəzindən 77 km məsafədədir. Beləliklə, aydın olur ki, "ağ" sözü bu deyimdə çoxumuzun düşündüyü kimi rəng mənasında yox, "düyü" mənasında işlənib. Bəs "qara" nədir? Elə çox adamı çaşdıran da "qara" sözüdür. Məsələ burasındadır ki, "qara" – ətdən, kişmişdən, şabalıddan, ərikdən və digər ərzaqlardan düzəldilən və plovun üstünə qoyulan yeməkdir. Yəni düyünü qarasız yesək, çox dadlı olmayacaq. Amma "qara" ilə yeyiləndə başqa aləm olur. "Qara" sanki üzüyün qaşına oxşayır. Ona görə deyirlər ki, "Ağın adı var, qaranın dadı", yəni düyüyə, daha doğrusu düyüdən hazırlanan plova dad verən onun üstündəki "qara"dır. Düyü sözünün yaranma etimalogiyası ilə bağlı fikirlərə gəldikdə isə birmənalı olaraq qeyd etmək olar ki, "düyü" *sözü "oruza"* latın sözündən əmələ gəlib. Düyüyə ərəblər də *"ərrüz"* deyiblər. Lakin əvvəllər düyünün adı "tuturqan" olub. Güman ki, bu da onunla bağlıdır ki, düyünü qaynadanda, bişirəndə bir birinə yapışır, sanki biri-birinin əlindən möhkəm tuturlar ki, ayrılmasınlar. Düyünün çəki vahidi qədim zamanlarda "əruzza" olub. Həqiqətən də "əruzza"nın "oruza" sözündən yarandığı göz qabağındadır. Yeri gəlmişkən, arruza – çəki vahidindən orta əsrlər dövrünün ən böyük müdrik təbiblərindən olan İbn Sina da dərman hazırlayan zaman iştifadə etmişdir. O, bir düyünün çəkisini 0,017 qram hesab etmişdir (Əmiraslanov, 2013, s.243). Diqqət etsək, "oruza", "əruzza", "ərrüz" sözlərinin bizim yaxşı bildiyimiz əruz vəzni ilə uyğunluğunu da görərik. Dilimizdə işlətdiyimiz "ruzi", yəni "bərəkət" sözü də çox güman ki, buradan qaynaqlanır. Fikrimizcə, bir çox Avropa və slavyan xalqlarının dillərində işlənən "ris", "rays", "riz" sözləri də elə "oruza", "əruzza", "ərrüz" sözlərindən götürülüb. Plovun bir çox türkcələrdəki formaları haqqında professor Mahirə Hüseynova yazır ki, "plov" sözü Türkiyə və özbək türkcəsində "pilav", başqırd türkcəsində "bilav", qazax türkcəsində "palav", qırğız türkcəsində "pilö", tatar türkcəsində "pilau", türkmən türkcəsində "piliv", uyğur türkcəsində "polo" şəklində olur (Hüseynova, 2018, s.136). Onu da qeyd edək ki, ölkəmizdə 200-dən çox plov növü var (təkcə Qarabağda plovun 130, Qubada isə 30-dan çox növü qeydə alınmışdır): şeştərəngi plov, şaşəndaz

plov, qır-qır plov, əriştə plov, nar plov, şirin plov, meyvə plov, fisincan plov, dolma plov, döşəmə plov, şah plov, mərci plov, lobya plov, paxla plov, zəfəran plov, axtaplov, gilənar plov və s. Əgər digər ölkələrin plov növlərini də bu siyahıya əlavə etsək, plovun sayını heç yüz aşbaz hesablaya bilməz. Amma düyüdən çoxsaylı və ən mükəmməl plovlar əlbəttə ki, Azərbaycandadır (Əmiraslanov, 2013, s.241). Plovun tərkibi ilə bağlı isə deyə bilərik ki, plov adətən 2 komponentdən ibarətdir: taxıl və ət. Taxıl deyəndə ən çox düyü nəzərdə tutulur, amma bulqur, noxud, qarğıdalıdan da plov bişirilir.

Tarixi çox-çox qədimlə səsləşən "aş" leksemi ilə bağlı bir el deyiminə diqqət edək: "Məsləhətli aş dadlı olar" (Atalar sözləri, 2013, s.135). Bəri başdan qeyd edək ki, sözü gedən deyimə zahirən oxşayan deyimlərimiz çoxdur. Məsələn, Məsləhətli don gen olar, Məsləhətlə atılan daş uzaq gedər, Məsləhət dananı qurda verər, Məsləhətə xəyanət olmaz və sair. Mətləbə keçməmişdən qabaq qeyd edək ki, "məsləhət" ərəb sözü olub, tərifi belədir: *B*ir işi necə görmək üçün verilən tövsiyələrə, göstərişlərə, başqa sözlə necə, nə cür hərəkət etməyin yollarını ehtiva edən təkliflərə "*məsləhət*" deyilir (X.M.). Bəs "Məsləhətli aş dadlı olar" nə deməkdir? Məsələ burasındadır ki, qədim zamanlarada "aş" deyəndə təkcə bu leksemin sinonimi olan plov deyil, qazan yeməklərinin bir çoxu, hətta duru xörəklər də nəzərdə tutulurdu. Məsələn, bozbaş, süddü aş, ayranaşı, xəmiraşı və s. Hətta böyük türk alimi Mahmud Kaşğarinin məşhur *"*Divanü Lüğat-it-Türk" kitabında da "aş" sözü təkcə aş kimi deyil, xörək kimi izah edilmişdir. Deməli, o zamanlar bəlkə də bütün qazan yeməklərinə "aş" deyirmişlər. Amma kababa heç zaman "aş" deyilməyib. Yeri gəlmişkən, Mahmud Kaşğarinin məşhur lüğətində qazan və ya tava "aşac" kimi qeyd edilmişdir ki, bu sözün də kökü göründüyü kimi "aş" sözündən götürülüb. Onu da qeyd edək ki, qədim zamanlarda binaları inşa etmək üçün indiki kimi lazımi riyazi hesabatların aparılması məlum olmadığı kimi, xörəkləri bişirmək üçün də vahid bir resept, yəni *bir xörəyi hazırlamağın üsulu, qaydası,* yolu olmamışdır. Odur ki, o zamanlar hər kəs xörəyi öz bildiyi və ağlına gəldiyi kimi bişirirmiş, nəticədə isə kiminsə xörəyi dadlı, kimininki duzlu, kimininki duzsuz, kimininki çiy, kimininki vaxtı ötmüş kimi alınmışdır. Vəziyyətdən çıxmaq üçün təcrübəsi az olanlar təcrübəli olanlardan lazımi məsləhətlər almış və nəticədə dadlı xörəklər bişirməyə müyəssər olmuşlar. Ona görə deyilib ki, məsləhətlə bişirilən təkcə aş deyil, bütün xörəklər dadlı olar. Ümumiyyətlə, aşla bağlı kifayət qədər atalar sözlərimiz və el deyimlərimiz var. Məsələn, Aşdır – bişər, işdir – düşər; Aşından yemədim, tüstüsündən kor oldum; Aşpazdan küsən evinə ac gedər; Aşpazxanada yeyir, dulusxanada hürür; Aşağı, aşağı, qatıqlı aşdan da aşağı? Aş bişirənə, iş bacarana; Aş daşanda çömçə baha olar; Aş yeyənin qaşığı belində olar, Südlü aş yaxşıdır, bir gün sizdə, bir gün bizdə; Aşbaz çox olanda xörək ya şit olar, ya şor və sair. Bu məsəllərdən biri haqqında da fikirlərimizi sizinlə bölüşmək istərdik. "Aşbaz çox olanda xörək ya şit olar, ya şor" deyimində, fikrimizcə, anlaşılmayan heç nə yoxdur. Mənası odur ki, bir xörəyi bir neçə aşbaz bişirəndə başları qarışır söhbətə, nəticədə çox şey nəzarətdən çıxır və bir-birindən xəbərləri olmur ki, xörəyə kim duz atıb, ya kim duz atmayıb. Bir birinə arxayın olaraq elə bilirlər ki, duzu o biri yoldaşı atıb, o birisi elə bilir ki, o birisi atmayıb özü duz atır, ya da əksinə. Beləliklə, xörək ya şit, yəni çox duzsuz, ya da duzlu, yəni şor olar. Ümumiyyətlə, hər hansı bir iş olur olsun, gərək arxayınçılığa yol verməyəsən, heç kimə ümid olmayasan. Bunun üçün həyatın yeganə qızıl qaydası var, gərək onu unutmayasan. Bu qızıl qayda belədir: Həyatda heç kimə ümid olmamaq! Əbəs yerə ulularımız deməyiblər ki, Danışıq dananı qurda verər, Qonşuya ümidli olan şamsız yatar və s. Yeri gəlmişkən, "şor" fars sözü olub, tərkibində çox duz olan şeylərə aid edilir. Məsələn, şor su (yəni duzlu su), şor pendir (yəni duzlu pendir) və s. Bir şeyi də qeyd edək ki, türk dillərinin Sibir türk dilləri qrupunun xakas yarımqrupuna aid olan "şor dili" və ya "şorca dili" də var. Üç dialektə malik olan şor dilində danışanlar əsasən Rusiyanın Altay və Kemerovo vilayətlərinin müəyyən hissələrində yaşayırlar. Tuva dilinə çox bənzəyən Şorca dili hazırda Rusiyada Kemerovo Universitetində tədris edilir. Bəlkə də bu dilin Qərbi Azərbaycanımızın Göyçə mahalının Çəmbərək rayonuna aid olan Şorca kəndi ilə əlaqəsi var. Nə bilmək olar? Hər halda araşdırmağa dəyər. Bizdən problemin anonsunu verməkdir.

## Nəticə

Beləliklə, bu məqalədə mədəniyyətimizi, milli-mənəvi köklərimizi, adət-ənənələrimizi, milli psixologiyamızı, mentalitetimizi əks etdirən və işləkliyi kifayət qədər yüksək olan bir çox el deyimlərinin müasir düşüncə prizmasından maraq kəsb etdiyinin şahidi oluruq. Ümumiyyətlə, hər bir

deyimin folklordaki poetik-idraki məzmunu və onların gözə asanca görünməyən fəlsəfəsi haqqında araşdırma aparmaq, fikrimizcə, maraqlıdır. Çünki söz sözü çəkdikcə çox mətləblərə aydınlıq gətirildiyinin şahidi oluruq. Bir də ki, bu incəlikləri biz tədqiq etməsək, yazmasaq, kim yazacaq ki?

**Ədəbiyyat**


1. *Atalar sözləri*. (2013). Tərtib edəni və ön sözün müəllifi: Mətanət Yaqubqızı. "Nurlan".
2. Əmiraslanov, T. (2013). *Söz mətbəxi*. "Nurlar" Nəşriyyat-Poliqrafiya Mərkəzi.
3. Hüseynova, M. (2018). *Azərbaycan dilinin yemək və içki adlarının tarixi-etimoloji lüğəti*. ADPU.
4. *Klassik Azərbaycan ədəbiyyatında işlənən ərəb və fars sözləri lüğəti*. (2005). İki cilddə, II cild. "Şərq-Qərb".
5. Məmmədov, X. (2022). "Ağ" və "qara" komponentləri ilə bağli paremioloji vahidlərin folklordaki poetik-idraki modelləri. *Filologiya məsələləri*, №3, s. 252-259.
6. Məmmədov, X., Musayeva, S. (2024). "Texnologiya müəllimliyi" hazirliğinda ölçü vahidlərindən istifadə səviyyəsi. *Elmi Tədqiqat. Beynəlxalq elmi jurnal*. Cild:4, Sayı:7, s.23-27.
7. Məmmədov, X., Musayeva, S. (2024). Kütlə ölçü vahidlərinin müqayisəli tədqiqi. *Elm və təhsilin əsasları. IX beynəlxalq elmi konfrans*. 09.08.2024, s. 26-29.
8. Mustafayev, Q., Məmmədov, A. (2008). *Atalar sözü - xalqın gözü*. "Təknur".


Daxil oldu: 14.12.2024
Qəbul edildi: 19.03.2025

https://doi.org/10.36719/2789-6919/43/26-31

**Cavid Musayev**
Bakı Dövlət Universiteti
doktorant
https://orcid.org/0009-0008-8407-1928
javidmusayev9@gmail.com

# İnklüziv təhsildə tədris prosesinin əsasları

**Xülasə**

Əlilliyi olan şagirdlər ictimai mühitə faydası toxunan şəxslər kimi yetişməlidir və cəmiyyətin inkişafına töhfə verəcək ümumtəhsil hüququna malik olmalıdırlar. Bütün şagirdlər inklüziv təhsil şəraitində fərqliliyin mahiyyətini daha dərindən anlayırlar. Bu məqalədə inklüziv təhsildə tədrisin mexanizmi model olaraq təsvir edilmiş, əlilliyi olan şagirdlər üçün inklüziv təhsil mühitinin yaradılması və tədrisin təşkili prosesi istiqamətində istifadə olunan strategiya və planlar müzakirə edilmişdir. Əlilliyi olan şagirdlərin cəmiyyətin bir üzvünə çevrilməsi, onların ümumtəhsil kurrikulum sisteminə inteqrasiya edilməsi üçün sistemli şəkildə təşviqedici, çərçivə və dəstək xarakterli xüsusi məlumatlar verilmişdir. İnklüziv siniflərdə tədrisin həyata keçirilməsi zamanı istifadə edilən "Birgə Öyrənmə Təlimi" və "Universal Öyrənmə Dizaynı" (UÖD) kimi metod və yanaşmalar həmçinin onların tərkib hissəsi haqqında təsvirlər qeyd edilmişdir. Əlilliyi olan şagirdlərin prioritet ehtiyaclarının müəyyən edilməsi, onların ümumi siniflərə cəlb edilməsi və akademik biliklərə yiyələnməsi üçün dəstək xarakterli Fərdi Tədris Planın hazırlanması və planın tətbiqi prosesi mərhələli şəkildə pedaqoji struktur olaraq izah edilmişdir. Fərdi Tədris Planı nümunəsi və tədris mühitinin modifikasiya xüsusiyyəti göstərilmişdir.

***Açar sözlər**: inklüziv təhsil, əlilliyi olan uşaqlar, tədris prosesi, strategiyalar, fərdi tədris planı*

**Javid Musayev**
Baku State University
Phd student
https://orcid.org/0009-0008-8407-1928
javidmusayev9@gmail.com

# Basics of the Teaching Process in Inclusive Education

**Abstract**

Students with disabilities should grow up as individuals who benefit the social environment and have the right to general education that will contribute to the development of society. All students understand the essence of diversity more deeply in inclusive education. This article describes the mechanism of teaching in inclusive education as a model, and discusses the strategies and plans used to create an inclusive educational environment for students with disabilities and the process of organizing teaching. Specific information has been provided that systematically encourages, frames and supports the integration of students with disabilities into the general education curriculum system and enables them to become members of society. Methods and approaches such as "Collaborative Learning" and "Universal Design for Learning" (UDL) used in inclusive classrooms, as well as their components are described. The process of preparing and implementing an Individualized Education Plan to support for identifying the priority needs of students with disabilities, involve them in mainstream classes and acquiring academic knowledge is explained in a step-by-step pedagogical structure. An example of an Individualized Education Plan and the modification of the learning environment are shown.

***Keywords**: inclusive education, students with disabilities, teaching process, strategies, individualized education program*

## Giriş

İlkin olaraq ümumtəhsil müəssisələrində inklüziv təhsil mühitinin yaradılması üçün qanunauyğunluq olmalıdır, məktəb idarəetmə heyətinin inklüzivliyə yönəlik pozitiv reaksiyaları, sinifdə şagirdlərin bir-birinə qarşı humanist, qayğıkeş və anlayışlı davranış münasibətlərinin formalaşması ilə təhsildə liderlik və sosial məsuliyyət anlayışları qorunmalıdır. İnklüziv siniflərdə dərs vaxtının səmərəli xərclənməsi, şagirdlərə təhsilin əhəmiyyətinin aşılanması, həmyaşıdların bir-birinə uyğunlaşması, akademik biliklərin əldə edilməsi, dərslərin əyani izah olunması, şagirdlərdə diqqət dağınıqlığının aradan qaldırılması, mənfi davranışları görməzdən gələrək müsbət davranışların nümunə alınması, modern texnologiya vasitələrindən istifadə edilməsi, bədii - estetik məşğuliyyət, fərdi yaradıclıq qabiliyyətləri, gələcəyə böyük ümidlərin bəslənməsi və şagirdlərin şərhlərinin diqqətə alınması və başqa amillər inklüziv dərs münasibətinin zənginləşməsinə zəmin yaradır. İnklüziv təhsilin tədrisi insanlar arasında düşüncə tərzinə çevrilməli və tətbiqi istiqamətində mütəmadi dəstək göstərilməlidir (Nilholm, 2021, s. 365).

Çağdaş dünyamızda vətəndaş cəmiyyətinin inkişafı üçün güncəl bilik və bacarıqlara ehtiyac duyulur, bu səbəbdən cəmiyyətin hər bir üzvünün dövlət təhsil imkanlarından yararlanmaq haqqı və hüququ vardır, lakin tarixi dövrlərə nəzər saldıqda əlilliyi olan uşaqlar birmənalı qarşılanmayıb, ümumtəhsil ocaqlarından təcrid edildiyi zamanlar olmuşdur. Salamanka Bəyanatından (UNESCO, 1994) sonra dünyanın bir çox ölkələrində inklüziv təhsil mövzusu aktuallaşdı. Əlilliyi olan uşaqları "Problemli uşaq" adlandırıb təhsildən kənar saxlanılması inklüzivliyə zidd bir əlamətdir. İnklüzivlik ictimaiyyət içində sosial ədalət münasibətlərinin yaranma təzahürüdür, potensial və bacarıq baxımından inkişaf səviyyəsi aşağı olan insanların cəmiyyətə inteqrasiya edilməsidir.

2006-cı ildə BMT tərəfindən Əlilliyi olan Şəxslərin Hüquqları haqqında Konvensiya qəbul edilmişdir. 24-cü maddə əlilliyi olan şəxslərin təhsil hüququnu təsdiq edir və onlara yaşadıqları ərazilərdə digər şəxslər ilə bərabər əsaslarla inklüziv formada pulsuz ibtidai və orta təhsil əldə edə biləcəyini göstərir (BMT, 2006). 60 ölkə konvensiyanı imzalasa da, ümumdünya təhsil kurrikulum ölçüsündə inklüziv təhsilin inkişafı qənaətbəxş deyil. Öyrənmə çətinliyi olan şagirdlər akademik mövzularda həmyaşıdlarından nəzərə çarpacaq dərəcədə geri qalırlar. Təbii ki, sosial ünsiyyət baxımından onlar xüsusi təcrübə qazanırlar. Lakin onların koqnitiv bilik və bacarıqlarını maksimum səviyyədə yüksəltmək üçün inklüziv təhsil şəraitini və imkanlarını daha keyfiyyətli təşkil etmək lazımdır. Təhsil, cəmiyyətin hər bir üzvü üçün gələcək ixtisas və məşğuliyyət sahəsini seçməkdə və müsbət ictimai hadisələrin bir parçasına çevrilməsi üçün açılan bir qapıdır. Təəssüf ki, təhsildə yüksək nəticələr qazanmaq üçün hər bir fərdin bərabər imkanlara malik olmasını təmin etmək bütün dünyada problem olaraq mövcuddur. İnklüziv təhsil prosesinin əsas qayəsi şagirdlərin qabiliyyət, sosial-iqtisadi və mədəni münasibətlərinin fərqliliyi açısından birləşdirici funksiya olduğunu göstərməkdir. İnklüzivlik şagirdlər arasında təcrid olunma və ayrıseçkilik etmə prinsiplərini rədd edir (Bombardelli, 2020, s.38).

**Tətqiqat**

*Koperativ Öyrənmə təlimi.* İnklüziv tədris prosesində bir neçə mühüm yanaşma vardır, onlardan biri Koperativ Öyrənmədir. Fərqli tərəfləri olan şagirdləri bir çətir altında toplamaq və qarşıya qoyulmuş hədəflərə çatmaq üçün dərslərdə fəal iştirakçı modeli yaradan bir pedaqoji metoddur. Müsbət qarşılıqlı bağlılıq, təşviqedici münasibətlər, fərdi məsuliyyət, qrup halında çalışma, şəxslərarası bacarıqlar koperativ öyrənmənin əsas tərkib hissəsi hesab edilir. Koperativ Öyrənmə inklüziv yanaşmaların tətbiqi prosedurunu asanlaşdırır, çünki bu təlim strategiyası sinifdə hamı üçün maraq dairəsi yarada bilir. Şagirdlərin bir-birinə dəstək olması, onların arasında müsbət mənada qarşılıqlı asılılığın yaranması, verilən tapşırıqların icrası üçün öz məsuliyyətlərini dərk etmələri tədrisin məqsədyönlü inkişaf tərəfləridir. Koperativ öyrənmə uşaqlarda tənqidi düşüncə xüsusiyyətinin bütünləşməsinə və əlilliyi olan şagirdlərin ünsiyyət quraraq sosiallaşmasına daha çox təsir edir (Nzuza, Chitiyo, 2024, s. 2-4).

Koperativ öyrənmə fəal olan və olmayan iştirakçılar üçün kiçik qruplarla qarşılıqlı əlaqədə təşkil edilmiş bir təlim üsuludur. İntellekt və öyrənmə səviyyələri fərqli olan, 4 – 6 nəfərdən ibarət heterogen qruplar yaradılır. Məsələn; diqqət dağınıqlığı olan uşağı diqqətini tam cəmləyə bilən bir uşaqla eyni qrupa salaraq, qruplar tamamlanır, fəal şagirdlərdən biri tapşırığın məzmununu digərlərinə izah

edir, burada önəmli olan uşaq tapşırığın şərtini başa düşməlidir, müzakirə əsnasında qrup içində fərqli ideyalar səslənir, bu situasiyalar uşaqlarda təsəvvürün və hafizənin inkişafına müsbət təsir bağışlayır. Tapşırığın nəticəsi qrup üzvlərinin çalışmasından asılıdır, müəllimlər qrup fəaliyyətini yoxlayır, şagirdlərin düşüncəsini, rəyini dəyərləndirir və qiymətləndirmə prosesi aparır (Loremann, Deppeler, Harvey, 2005, s. 182).

Beynəlxalq səviyyədə tanınan inklüziv təlim proqramlarından biri də Universal Öyrənmə Dizaynı (UÖD) adlanır. Bu proqram öyrənmə rahatlığını maksimum, öyrənmə çətinliyini minumum səviyyəyə çatdırmaq niyyəti ilə tətbiq edilir. Proqramın əsas vəzifəsi dərsləri müxtəlif diqqət çəkici yollarla izah edir, şagirdlər arasında öyrənmə funksionallığını fəallaşdırır. UÖD təlim proqramının əsas prinsipləri aşağıda qeyd edilir.

- Öyrədiləcək dərsin ayrı-ayrı formada, səciyyəvi yollarla izah edilməsi
- Fəaliyyətin və özünü ifadə etmə bacarığının sadələşdirilməsi
- Qeyri - adi məşğuliyyət, maraq və motivasiyanın artırılması

Proqramın tətbiqi sayəsində öyrənmə çətinliyi olan şagirdlərdə məntiqi ardıcıllıq, obyektləri eyniləşdirmə və ya fərqləndirmə, oxuduğu yazıları başa düşmə və düzgün səs tələffüzü kimi bir sıra bacarıqlar inkişaf edir, çalışmalar kurrikulum dərs sisteminin tələblərinə və qaydalarına uyğun olaraq aparılır. UÖD proqramının verdiyi imkanlar ilə şagirdlər və müəllimlər arasında ortaq diqqətin artırılması və yeni model texnologiya cihazlarına əsaslanan dərs motivlərinin seçilməsi ilə təhsildə böyük müvəffəqiyyətlər qazanmış ola bilərlər. İnklüzivliyin uğurlu şəkildə tətbiq edilməsi üçün müəllimlərin pedaqoji hazırlığı, müsbət davranışları və əməkdaşlıq səriştələri əsas amillərdir. UÖD proqramı ilə bağlı aparılan elmi tətqiqatların nəticəsi olaraq sinif müəllimləri və xüsusi təhsil pedaqoqlarının bu sahədə peşəkarlaşması üçün çox unikal təcrübəyə ehtiyacları olduğu fikri ortaya çıxmışdır (Dalton, Mckenzie, 2020, s. 4).

*Fərdi Tədris Planının hazırlanması və tətbiqi prosesi.* Hər bir çətinliyə rəğmən fərq qoymadan əlilliyi olan və olmayan uşaqlara dərs demək müəllimlərin mənəvi borcudur. Bu eyni zamanda qanuni bir tələbdir, əlilliyi olan şagirdlərin ümumi təhsil sisteminə salınması onların bacarıq imkanlarını dəyərləndirməklə və üstün tərəflərinə əsaslanan bir yazılı sənədin hazırlanması ilə başlayır. FTP-nın tərtib edilməsinin inklüziv təhsil sisteminin inkişafı açısından çox böyük əhəmiyyəti vardır. Əlilliyi olan uşaqların inkişaf mexanizmini nə qədər dərindən anlasaq, tədris planının vacibliyini də bir o qədər yaxşı anlaya bilərik. Planın ümumi strukturu bütün təhsil komandasına addım-addım necə çalışmalı olduğunu izah etməlidir. Fərdi Tədris planının yazılması məktəb inzibatçıları və müəllimlərin birlikdə görməli olduğu işdir, məktəbdə öyrədiləcək proqramın hamısının fərdi tədris planına yerləşdirilməsi şərt deyil. Əsas məsələ prioritet olan nüanslara diqqət etməkdir. Əlilliyi olan uşaqların adi siniflərə yerləşdirilməsinin ən gözəl yolu FTP-nın inamlı və mərhələli şəkildə təşkil edilməsidir. Şagirdlərin akademik, sosial və ictimai uğur qazanmasında sinif müəllimi ilə birlikdə eyni zamanda xüsusi təhsil pedaqoqu da məsuliyyət daşıyır (Garret, 2017, s. 81).

FTP-nın yazılması üçün tələbə haqqında dərin məlumatların əldə edilməsi gərəkdir. Valideynlərlə aparılacaq müsahibələr və şagirdə tətbiq ediləcək psixoloji inkişaf testləri ilə tələbənin akademik, sosial, emosional və özünü idarəetmə bacarıqları haqqında mövcüd səviyyə məlumatları toplanır. Tələbənin bilik – bacarıqları, inkişaf özəllikləri və qabiliyyət performansı təsvir edilir. Sənəd üzərində uşağın mövcud inkişaf qiymətləndirmə tarixi yazılmalıdır. Planın tərtib edilmə sorğusu məktəb direktoruna göndərilir, sonra müvafiq dövlət təhsil qurumları hesabat aparır. Bir sözlə, FTP əlilliyi olan tələbə haqqında rəsmi bir pedaqoji sənəddir. Tədrisin ilinin başlanğıc ərəfəsində əlilliyi olan tələbələrin valideynlərinə uşaqların yaşına uyğun sinifə yerləşdirilməsi, dərs fəaliyyət planı və gələcəkdəki iclaslar ilə bağlı məlumatlar çatdırılır (Elder etc, 2018, s. 127-138). Tədris planının hazırlanmasında uşağın müxtəlif inkişaf sahələrinin prioritet ehtiyacları müəyyən edilir. Məsələn; dil və ünsiyyət sahəsinin inkişafı üçün (danışığın başa düşülməsi, lüğət ehtiyatı, səs tələffüzü, söhbət bacarığı), fiziki motor sahəsinin inkişafı üçün (vücud fərqindəliyi, hərəki bacarıqlar, müvazinət, əl-göz koordinasiyası), sosial - emosional sahəsinin inkişafı üçün (sosial iş birliyi, duyğuların başa düşülməsi və kontrolu, ətraf mühiti və hadisələri dərk etmə), gündəlik həyat bacarıqları sahəsinin inkişafı üçün (özünü müstəqil idarəetmə, qidalanmaq, paltar geyinmə, şəxsi gigiyena) kimi xüsusiy-

yətlər formalaşmalıdır (Behluli, Krasniqi, 2017, s. 18). Məhz uşağın şəxsi öyrənmə ehtiyaclarını, onun spesifik xüsusiyyətlərini incələmək üçün komissiya qiymətləndirmə prosesinə qədər valideynlər birmənalı olaraq bütün hissələrdə iştrak etməlidir. Müəllimlər və valideynlər arasında möhkəm tərəfdaşlıq əlaqələri qurulmalıdır, bu münasibətlər inklüziv təhsilin təşkili keyfiyyətini yüksəldəcək və tərəflər arasında müsbət əhval ruhiyyə yaradacaq (Jachova, Kovacevic, 2018, s. 90). Digər bir tərəfdən əlilliyi olan şagirdin müstəqil bir şəxs kimi yetişməsi üçün akademik biliklərə yiyələnməsi tədrisdə əsas məsələ hesab edilir. Oxuma, yazma bacarıqları və riyaziyyat fənni tədris planının mərkəzində dayanır, çünki digər fənlərin öyrənilməsində giriş rolu oynayır. Sözün sonundakı şəkilçiləri və uzun sözləri düzgün tələffüz etməsi, hekayə və real mətnləri danışa bilməsi onların akademik inkişafına dəstək olacaqdır (Andreasson and Carlsson, 2013, s. 61).

Fərdi Tədris Proqramının tətbiqi prosesi mərhələli şəkildə aşağıda göstərilmişdir.

- Gələcək yaşam planlarının müəyyən edilməsi
- Kompleks test qiymətləndirmə nəticəsi
- Uzun müddətli hədəflərin ortaya qoyulması
- Davranış problemlərinə aid çalışmalar
- İnklüziv strategiyalar və yanaşmalar
- Proqramın monitorinq yoxlanması

Təbii ki, əlilliyi olan şagirdin ailə üzvləri uşağın gələcəkdəki yaşamını düşünür, müstəqil şəkildə özünü idarə edə bilməsi üçün müəyyən peşə qabiliyyətinə yiyələnməsini arzu edir. Təhsil komandası valideynin gözləntilərini və uşağın mövcud test nəticələrini nəzərə alır, daha sonra uzunmüddətli və qısamüddətli hədəfləri müəyyən edərək kurrikulum təhsilini dəstəkləyir. FTP-ın tətbiqində pedaqoji hissə çox vacibdir. Müşahidələrə əsasən əlilliyi olan şagirdlərin sinifdə göstərdiyi davranış problemləri inklüziv təhsil mühitində şagirdlərin dərs öyrənmə prosesinə maneələr yarada bilir. Arzuolunmaz davranışların aradan qaldırılması üçün "pozitiv davranış müdaxilələri", "davranış xatırlamaları" və başqa strategiyalar həyata keçirilir. Xoşagəlməz davranışlar baş verdiyi vaxtda müəllimlər şagirdlərə onların davranışlarını necə idarə edəcəklərini xatırladır. Bununla yanaşı, əlilliyi olan şagirdin maksimum səviyyədə nailiyyət qazanmasında sosial-emosional paylaşım, həmyaşıdların ruhlandırıcı təsiri, özünü tənzimləmə, hərtərəfli oxu proqramları, fonematik qavrama səriştələri, prioritet bacarıqların önə çıxarılması, tematik dərs planları tədrisin açar strategiyaları sayılır. Hər tədris rübünün sonunda FTP-nın yenilənmiş tətbiqi kurrikulum proqramına əlavə dəstək yaradır. Sinif qaydalarına uyğun şəkildə davranış sərgiləmək, yazma və oxuma bacarıqlarını inkişaf etdirmək inklüziv təhsil prosesinin əlamətdar prinsipləridir. Bu səbəbdən şagirdlərin təhsil kurrikulumuna uyğunlaşması üçün şifahi danışıq dilinin sadə olması lazımdır. Tədris zamanı xüsusi təhsil pedaqoqu dərs materialının başa düşülməsi üçün əyani vəsaitlərdən istifadə edir. Tapşırığı, testləri və başqa çalışmaları bitirmək üçün ehtiyac olarsa, uşaqlara əlavə vaxt verir (Mitchell, Sutherland, 2020, s. 88).

**Fərdi Tədris Planı nümunəsi**

<table>
<tr><td>Şagird haqqında məlumatlar:</td><td>Şagirdin adı, soyadı:</td><td>Tədris ili:</td></tr>
<tr><td>Şagirdin doğum tarixi:<br>Məktəb:<br>Sinif:<br>Ünvan və Əlaqə telefonu:</td><td colspan="2">Planın hazırlanma tarixi:</td></tr>
<tr><td>Şagirdin gələcək yaşam gözləntiləri</td><td colspan="2">Cəmiyyət içində özünü sərbəst, müstəqil idarə edə bilməsi, iş qabiliyyətinə yiyələnə bilməsi, ətraf insanlarla sosial-emosional münasibət qura bilməsi;</td></tr>
<tr><td>İlkin test qiymətləndirmə nəticələri<br>Veksler testinin tətbiqi</td><td colspan="2">Sadə məntiqi təfəkkür var, hadisələr arasında tam əlaqə qura bilmir;<br>Söz və cümlələr istifadə edir, söhbət bacarığı zəifdir;</td></tr>
</table>

| | |
|---|---|
| İntellekt, ünsiyyət, sosial-emosional, davranış, motor və akademik inkişaf sahələri üzrə test edilir. | Qarşılıqlı sosial əlaqələr qurulmasında çətinlik çəkir;<br>Yazı zamanı və müəyyən idman hərəkətlərində kiçik və böyük motor problemi vardır;<br>Oxuma, yazma və hesab çətinlikləri var; |
| Hədəflər<br>(uzun müddətli və qısa müddətli hədəflər) | Ümumi inkişaf sahələri üzrə prioritet olan səriştələrin inkişafını təmin etmək;<br>Fənn biliklərinin (ana dili, riyaziyyat, həyat bilgisi, rəsm) öyrənilməsi; |
| Təhsil proqramı üzrə monitorinq aparılması | Şagirdin nailiyyətləri yoxlanılır, qiymətləndirmə nəticəsindən asılı olaraq əlavələr və ya dəyişikliklər edilməsi. |
| Fərdi tədris proqramını icra edən məsul şəxslər | Məktəb direktoru<br>Sinif müəllimi<br>Xüsusi təhsil pedaqoqu<br>Məktəb psixoloqu, loqoped<br>Valideynlər |

Qeyd: Fərdi Tədris Planının bir nüsxəsi valideynə verilməlidir.

Kurrikulum proqramları fərdi və universal ola bilir. Universal kurrikulum sinifdə olan bütün şagirdlərə aid edilir. Fənnlər üzrə dərs materialı kurrikulum dəstəyi ilə şagirdlərdə akademik komponentləri və sosial təcrübənin inkişafını artırır. Bəzi hallarda fənn dərslərinin mövzuları əlilliyi olan şagirdlərdə öyrənmə çətinliyi yaradır. Bu halda şagirdin əsas fənlərə qarşı (məsələn, təbiətşünaslıq) öyrənmə perspektivliyinin azaldığı müşahidə edilirsə və ya dərslərindən geri qaldığı görülərsə, fərdi dərs planına mövzü dəyişikliyi edilir, mövzu dəyişikliyi üçün şagirdin ailəsi və sinif müəllimləri birlikdə çalışır (Kurth etc, 2020, s. 143).

Eyni zamanda, əgər inklüziv tədris mühitində zəruri olarsa, qaydalar çərçivəsində müəyyən dəyişikliklər (tədris mühitinin modifikasiyası) edilə bilər. Bəs tədris mühitin modifikasiyası nədir? Sinfin fiziki mühitinin, tədris vəsaitlərinin və strategiyalarının dəyişikliyi deməkdir. Bu düzəliş və dəyişiklik dövlət təhsil standartlarına uyğunlaşmalıdır. Yeni təhsil planları tərtib edildikdə mütləqdir uşağın spesifik məlumatları bir daha nəzərdən keçirilsin. Tədris planlarında dəyişiklik olsa da, müəllimlər çalışmalıdır ki, əlilliyi olan şagirdin aldığı tədrisin ümumi məzmunu sinifdə keçirilənlər ilə uyğun olsun (Garret, 2017, s. 82).

## Nəticə

Fərdi Təhsil Planı-nın (FTP) kontekstinin aydın başa düşülməsi, dərslərin qanunauyğun formada tərtib edilməsi, qrup təlimatları, valideynlər və müəllimlər arasında işbirliyi, müxtəlif öyrənmə versiyaları, həmyaşıdların sinifdə mehriban münasibətləri və başqa amillər öz çərçivəsində olduğu halda, əlilliyi olan şagirdlərin akademik və sosial nailiyyətlər qazanacaqları gözlənilir. İnklüziv təhsilin təşkili zamanı müəllimlər fərqliliyi olan şagirdlərə fərqli dərs strategiyaları seçməklə onların inkişafına xidmət göstərir. FTP - nın tətbiqinin əsas funksiyası əlilliyi olan şagirdlərə real həyat bacarıqlarını qazandırmaq və yüksək təhsil standartlarını təmin etməkdir. Şagirdlərin üstün tərəflərinə əsaslanan yanaşmalardan istifadə edərək sosial ədalət formulu yaratmaq və təhsilin uğurlu təcrübəsini ortaya çıxarmaqdır. Bu prosesdə müəllimlər uşağın yazılmış tədris planına uyğun şəkildə inkişaf edib-etmədiyini izləməlidir və uğurlu olduğu halda bu gedişi ümumi məktəb miqyasında stabil hala gətirməyə çalışmalıdırlar. Digər bir tərəfdən (UNESCO, 2009) sinif müəllimləri, xüsusi təhsil pedaqoqları, yeni fəaliyyətə başlamış köməkçi müəllimlər əlilliyi olan şagirdlərə və yeniyetmələrə gündəlik fəaliyyət və təhsil prosesində yardımçı olmaq məqsədiylə daha çox təcrübə qazanmaq üçün əlavə praktik təlimlər almalıdırlar.

## Ədəbiyyat

1. Andreasson, I. Carlsson, M,A. (2013). Individual educational plans in Swedish schools-forming identity and govering functions in pupils documentation. *International Journal of Special Educational*, Vol 28, No 3.
2. Behluli, L., Krasniqi, R. (2017). *İndividual educational plan (IEP) and guidelines for drafting an individual educational plan for children with special educational needs*.
3. Bombardelli, O. (2020). Inclusive education and its implementation: international practices. *Education & Self Development* 15 (3) 37-46 DOI: 10.26907/esd15.3.03.
4. Dalton, E., Mckenzie, J. (2020). Universal design for learning in inclusive education policy in South Africa. *African Journal of Disability* 9(3) DOI:10.4102/ajod.v9i0.776.
5. Elder, B., Rood, C., Damiani, M. (2018). Writing strength – based IEP for students with disabilities in inclusive education. *International Journal of Whole Schooling*, Vol. 14, № 1.
6. Garret, F.R. (2017). *Teachers perseption of professional development benefits for teaching in inclusive classrooms*. Walden University Scholar works.
7. Jachova, Z., Kovacevic, J. (2018). Individual educational plan foundation of a quality inclusive education. *Journal Human Research in Rehabilitation September* 2018, DOI: 10.21554/hrr.091811.
8. Kurth, J., Miller, A,L., Toews, S. (2020). Preparing for and Implementing effective inclusive education with participation plans. *Teaching Exceptional Children*, Vol. 53, No 2.
9. Loremann, T., Deppeler, J., Marvey, D. (2005). *Inclusive education: A practical guide to supporting diversity in the classroom*.
10. Mitchell, D., Sutherland, D. (2020). *What really works in special and inclusive education*.
11. Nilholm, C. (2021). Research about inlusive education in 2020 – How can we improve our theories in order to change practice? *European Journal of Special Needs Education*, Vol. 36, No. 3, 358–370.
12. Nzuzo, Z. Chitiyo, M. (2024). Coorperative learning as an approach to enhange the implementation of inclusive education. *International Journal of Whole Schooling*, Vol. 20, No 2.
13. *The Salamanca Statement and Framework for Action on special needs education*. (1994).
14. UNESCO. (2009). Policy guideline on inclusion in educationə *Publication ED* – 2009/WS/31.
15. United Nations. (2006). The UN Convention on the rights of persons with disabilities. social.desa.un.org/issues/disability/crpd/article-24-education.

Daxil oldu: 16.12.2024
Qəbul edildi: 19.03.2025

https://doi.org/10.36719/2789-6919/43/32-35

**Gulnara Nasibova**
Ganja State University
PhD student
https://orcid.org/0000-0001-8255-2260
gulnarnsibova6@gmail.com
**Urgiyya Hajiyeva**
Ganja State University
https://orcid.org/0009-0009-1012-6671
mujgan.rustemova@gmail.com
**Aytan Rahimli**
Ganja State University
https://orcid.org/0009-0008-4603-2645
1111aytanrahimli@gmail.com

# Holistic Analysis of a Literary Work

**Abstract**

One of the most pressing central problems of theory today is the systematic development of the theory of literature of a work of art.

The brilliant idea of distinguishing between the content and formal aspects of a work of art has determined the main trend in the study of the problems of a work for centuries. Content traditionally includes all aspects related to the semantic aspect of creativity (understanding and evaluation of reality). The plane of expression, the phenomenological level, is related to the area of form (Ubaidova, Ergasheva, 2021).

At the same time, this same fundamental idea provoked a simplified approach to the analysis of works. On the one hand, scientific analysis of content is often replaced by so-called interpretation, i.e. arbitrary recording of subjective aesthetic impressions, when what is valued is not objective knowledge of the patterns of formation and functioning of a work of art, but an originally expressed personal attitude towards it.

***Keywords:*** *literary work, humanitarian disciplines, philosophical problems, aesthetic problems, strictly speaking*

**Gülnarə Nəsibova**
Gəncə Dövlət Universiteti
doktorant
https://orcid.org/0000-0001-8255-2260
gulnarnsibova6@gmail.com
**Urqiyyə Hacıyeva**
Gəncə Dövlət Universiteti
https://orcid.org/0009-0009-1012-6671
mujgan.rustemova@gmail.com
**Aytən Rəhimli**
Gəncə Dövlət Universiteti
https://orcid.org/0009-0008-4603-2645
1111aytanrahimli@gmail.com

# Ədəbi əsərin vahid təhlili

**Xülasə**

Bu gün ən aktual olan nəzəriyyənin mərkəzi problemlərindən biri bədii əsərin ədəbiyyat nəzəriyyəsinin sistemli inkişafıdır. Əsrlər boyu bədii əsərin məzmunu ilə formal cəhətlərinin fərqləndiril

 

Разработка стратегий развития вуза – это комплексный процесс, требующий глубокого понимания как общих принципов стратегического управления, так и специфики образовательного сектора (Минцберг, Куинн, Гошалс, 2001). Особое внимание следует уделять уникальным особенностям образовательных услуг, предлагаемых конкретным вузом. В то время как многие высшие учебные заведения придерживаются стандартных образовательных программ, все большее число вузов стремится к персонализации обучения, предоставляя студентам возможность гибко формировать свой образовательный маршрут. Это достигается за счет модульной структуры учебных планов, широкого спектра элективных курсов и возможности межфакультетской мобильности. Такой подход не только повышает мотивацию студентов, но и способствует развитию их индивидуальных талантов (Дудырев, 2006). Более того, современные вузы все чаще трансформируются в инновационные университеты, ориентированные на создание новых знаний и технологий. Они активно участвуют в научно-исследовательской деятельности, сотрудничают с промышленными предприятиями и стартапами, а также экспортируют образовательные услуги на международный рынок. Экспорт образования не ограничивается только традиционными формами обучения, но включает в себя онлайн-курсы, международные программы двойных дипломов и академическую мобильность.

## Заключение

Таким образом, необходимые изменения в вузах, направленные на повышение их конкурентоспособности на рынке образовательных услуг, могут быть успешно реализованы только в рамках продуманной и системной стратегии развития. Для построения будущей модели высшего учебного заведения – инновационного университета, способного адаптироваться к быстро меняющимся условиям и удовлетворять растущие потребности общества, необходимо использовать весь арсенал современных инструментов стратегического управления (Сундукова, Бобылева, Деревягина, 2019). Практическое применение представленных методических рекомендаций по разработке стратегии развития позволит вузам не только мобилизовать имеющиеся ресурсы и обеспечить активное участие всех сотрудников в процессе изменений, но и создать условия для непрерывного совершенствования и адаптации к новым вызовам. Реализация стратегии должна сопровождаться регулярной оценкой достигнутых результатов и корректировкой планов, что позволит обеспечить ее актуальность и эффективность в долгосрочной перспективе. В конечном итоге, успешная реализация стратегии развития позволит вузу занять лидирующие позиции на рынке образовательных услуг, повысить свою репутацию и внести значительный вклад в развитие общества.

В заключение следует отметить, что разработка и реализация стратегии развития вуза – это сложный и многогранный процесс, требующий системного подхода и активного участия всех заинтересованных сторон. Однако, инвестиции в стратегическое планирование окупаются многократно, обеспечивая вузу устойчивое развитие и долгосрочный успех.

## Литература

1. Балобанов, А.Е., Клюев, А.К. (2002). Стратегическое планирование развития университета. *Университетское управление: практика и анализ,* 2(21), 19-27.
2. Дудырев, Ф.Ф. (2006). Инновационные вузы: основные векторы развития. *Университетское управление: практика и анализ.* №6. URL: https://cyberleninka.ru/article/n/innovatsionnye-vuzy-osnovnye-vektory-razvitiya.
3. Кирилина, Н.А. (2011). Стратегические подходы к развитию ВУЗа. *Вестник ассоциации вузов туризма и сервиса*, 1, 27-32.
4. Минцберг, Г., Куинн, Дж.Б., Гошалс. (2001). *Стратегический процесс.* (пер. с англ.). под ред. Ю.Н. Каптуревского.
5. Николаева, А.Д. (2014). Стратегический подход к управлению образованием. *Фундаментальные исследования, 8*, 1667-1671.

 

6. Плаксий, С.И. (2018). Стратегические подходы к развитию ВУЗов. *Вестник НИБ*. №32. URL: https://cyberleninka.ru/article/n/strategicheskie-podhody-k-razvitiyu-vuzov.
7. Портер, М. (1993). *Международная конкуренция: конкурентные преимущества стран*. Альпина Паблишер.
8. Сундукова, Г.М., Бобылева, Н.В., Деревягина, Л.Н. (2019). Стратегическое управление вузом в условиях цифровой экономики. *Вестник евразийской науки*, 11 (3), 27.

Поступило: 24.11.2024
Принято: 05.03.2025

https://doi.org/10.36719/2789-6919/43/50-53

**Bənövşə Əsgərova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0009-0001-8610-178X
banovshaasgarova85@mail.ru

# Müxtəlifsistemli dillərdə qohumluq bildirən frazeoloji birləşmələrin sosio-linqvistik təhlili

**Xülasə**

Frazeoloji birləşmələr hər bir xalqın həyat təcrübəsini, tarixi keçmişini, adət və ənənələrini, mentalitetini, müdrikliyini, hazırcavablığını, mürəkkəb situasiyalardan baş çıxarmaq qabiliyyətini əks etdirən obrazlı linqvistik vahidlərdir. Zamanın sınağından çıxan, nəsildən-nəslə ən qiymətli yadigar kimi keçən frazeoloji vahidlər özlərinin kommunikativ-ifadə zənginliklərini saxlamaqla getdikcə cilalanır, saflaşır, məna siqləti, obrazlılığı artır, yeni-yeni məna çalarları kəsb edir. Dünyanın bütün dillərində frazeoloji vahidlərin yaranma yolları və üsulları eyni olmasa da, oxşar və universal cəhətləri çoxdur. Bu, hər şeydən əvvəl, dildaxili və dilxarici amillərin təsiri ilə izah oluna bilər.

Frazeoloji birləşmələrin bir qismi qohumluq terminləri leksikası əsasında formalaşır. Qohumluq terminlərinin iştirakı ilə yaranmış frazeologizmlər bütün dünya dillərində geniş yayılmışdır. Maraqlıdır ki, bu baxımdan bütün mövcud dil sistemlərində bir yaxınlıq hiss olunur. Bu baxımdan ayrı-ayrı dilləri birləşdirən universal xüsusiyyətlər daha çox nəzər-diqqəti cəlb edir. Qohumluq terminlərilə düzələn frazeologizmlərdə hər hansı bir qohumluq bildirən, ailə üzvlərinin münasibətlərini bildirən sözlərin iştirak etməsilə düzələn vahidlərdir. Qohumluq anlayışları ifadə edən sözlər bütün üslublarda işlədilir və frazeoloji vahidlərinin komponenti kimi xüsusi ekspressiv, üslubi çalarlıq ifadə edir.

***Açar sözlər:*** *frazeoloji birləşmə, linqvistik təhlil, termin, üsul, etnoqrafik material*

**Banovsha Asgarova**
Azerbaijan State Pedagogical University
https://orcid.org/0009-0001-8610-178X
banovshaasgarova85@mail.ru

# Socio-Linguistic Analysis of Phraseological Units Expressing Kinship in Languages of Different Systems

**Abstract**

Phraseological units are figurative linguistic units that reflect the life experience, historical past, customs and traditions, mentality, wisdom, resourcefulness, and ability to cope with complex situations of each people. Phraseological units that have stood the test of time and passed from generation to generation as the most valuable relics, while maintaining their communicative and expressive richness, are gradually polished, refined, increase in meaning, figurativeness, and acquire new shades of meaning. Although the ways and methods of the formation of phraseological units in all languages of the world are not the same, they have many similar and universal aspects. This can be explained, first of all, by the influence of intralinguistic and extralinguistic factors.

Some phraseological units are formed on the basis of the lexicon of kinship terms. Phraseologisms formed with the participation of kinship terms are widespread in all languages of the world. Interestingly, in this regard, a closeness is felt in all existing language systems. In this regard, universal features that unite different languages attract more attention. Phraseologisms formed with kinship terms are units formed with the participation of words that indicate any kinship, indicating the relationship of family members. Words expressing kinship concepts are used in all styles and, as components of phraseological units, express a special expressive, stylistic shade.

***Keywords:*** *phraseological combination, linguistic analysis, term, method, ethnographic material*

## Giriş

Bəşər övladı var olduğu gündən onlar arasında qohumluq münasibətləri və təbii ki, müraciət üçün onları təyin edən terminlər də mövcuddur. Qohumluq ailə üzvlərini və bu statusla əlaqəli ailələrin rollarını və ya gözlənilən davranışların müəyyən etmək üçün istifadə olunan şərtləri və ya statusları ehtiva edir. Etnoqrafik materiallara əsasən deyə bilərik ki, qohumluq münasibətlərinin iki cəhəti diqqəti cəlb edir: yaxın və uzaq qohumlar. Bu əlaqəyə daxil olan yaxın qohumluq münasibətləri doğmalıqla bağlıdır. Buraya atanın soyadından olan 3-4 nəsil həddində olan qohumlar daxildir.

Bir çox qohumluq kateqoriyası başqa dillərdə müşahidə edilmir. Niyə bəzi dillərdə qohumluq kateqoriyalarının olduğu, o birisində isə olmadığı sualını doğurur. Bütün dillərdə mövcud qohumluq şərtləri olsa da, lakin hamısı eyni şəkildə ailə üzvlərini kateqoriyalara daxil etmir. Bu da mədəniyyət, etnik mənsubiyyətlə tarixən əlaqədardır. Xristianlarda və ingilislərdə *god parents - xaç valideynləri, god father- xaç ata, godmother - xaç ana, godchild-xaç ovlad* kimi anlayışlar var ki, bunlar hər ailə qanununa tabe olsalar belə (yəni onların arasında evlilik tabu), fiktiv-yalançı sayılır. Mədəniyyət anlayışlarının müxtəlifliyi özünü ən çox sosioloji faktlarda biruzə verir. Məsələn, azərbaycanlılarda işlənən *böyük toy, kiçik toy, qız toyu, oğlan toyu*- söz birləşmələri başqa xalqlara qəribə görünür.

Bəzən də frazeoloji evfemizmlərdən (yumşalmış, mərifətli və bəlağətli sözlər) istifadə olunur. Məsələn, *to die (ölmək*) variantları mövcuddur. *To go to one's last resting place* (son mənzilə köçmək, getmək); *to join the majority* (əbədiyyətə qovuşmaq). Ailə münasibətlərində işlənən evfemizm çox istifadə edilir, məsələn: *pregnant* (hamilə) əvəzinə *expecting a baby in a delicate condition, in a cetrain position, eating for two, to be in the family way*.

**Tədqiqat**

Azərbaycan dilində də belə frazeologizmlər var. Məsələn, *iki canlı olmaq, boylu olmaq, yüklü olmaq, ağır ayaq olmaq* və s.

Qohumluq münasibətlərinin qədim kökləri olduğu kimi onların termin kimi bu gün müxtəlif dillərdə işlənməsi də nitq fəaliyyətinin tarixi ilə müəyyənləşir. İngilis dilində sosioloji qohumluq terminləri aşağıdakı şəkildə qruplaşdırılır (Koonin, 2000, s.56):

1. Bir kökdən olan qohumluq terminləri: *husband, bride, brother, mother, baby, child, heir, infant, son, niece*

2. İki kökün birləşməsindən ibarət *great-grandmother (great-father), first-cousin (second), father-in-law (mother-in-law), sister-in-law, brother-in-law, adopted child, adoptive father, foster father, relative in-law, kit and kin-qohum-tanış.*

Düzəltmə sözdən: *Widower, bridehood, grandparents, grandfathers (grandpa), grandmother, grandson (granddaughter, grandchildren), bridegroom, stepchild (stepson, stepdaughter), kinsfolk*.

Bir kökdən ibarət olan sosioloji qohumluq termimləri mənşəcə eyni deyildir. Onların bəziləri: a. doğma ingilis dili sözləridir. Məsələn, *wife, bride*.

b. skandinav mənşəli sözlərdir. Məsələn, *husband (ər) qədimdə husban-da* kimi olmuşdur.

Latın dilindən keçən dini tetminlər. İngilis dilində sosioloji qohumluq terminlərin əsas hissəsi qan qohumluğu terminləri əsasında yaranmışdır. Məsələn, *mother-in-law, father-in-law, sister-in-law, brother-in-law, stepsister, stepbrother, stepson, stepchild*. Müasir ingilis dilində nikah qohumluq terminləri qədim ingilis dilində mövcud olmayıb. Məsələn, qədim ingilis dilində *qayın* aşağıdakı kimi ifadə olunurdu: the lady's husband's brother. My *wife-s brother-brother-in-law, sister-in-law*.

Mürəkkəb nikah terminlərinə orta və erkən yeni ingilis dilində təsadüf edilir. Bu tip terminlər tevton mənşəlidir: brother əsl ingilis sözü, law -skandinav mənşəlidir. Azərbaycan dilindən fərqli olaraq bu sözün bir neçə mənası var: bacanaq, yeznə, qayın.

Azərbaycan dilində qohumluq terminləri başqa dillərdə olduğu kimi qohumluq münasibətləri nəsil üzrə yaş fərqi, cins, yaxın və ya uzaq qohumluq, semantik əlamətlərinə görə fərqlənən terminlərlə ifadə olunur. Müasir Azərbaycan dilində yaş fərqinə görə təyin olunan xüsusi qohumluq terminləri mövcud deyil. Yalnız müəyyən dialektlərdə müşahidə oluna bilər. X.Q.Yusubov qohumluq terminlərini qan qohumluğu və nikah qohumluğu olaraq təsnif edir. T.Cəfərov isə qohumluq terminlərini 3 qrupa bölür (Cəfərov, 1985, s.35):

1.Bioloji-sosioloji qohumluq terminləri;

2. Sosioloji qohumluq terminləri;

3. Qohumluğa yaxın münasibətlər bildirən terminlər.

Azərbaycan dilində olduğu kimi, ingilis dilində də qohumluq termini ilə bağlı frazeoloji birləşmələr məişət danışıqlarına daha çox nüfuz etmişdir. Qohumluq terminləri ilə işlənən frazeoloji birləşmələr digərləri kimi məna uğurluğu olsa belə, sözlərin leksik mənalarından kənar işlənməsidir.

*To step into father shoes-atasını yolu ilə getmək; Be tied to (one's) mother's apron strings-anasının ətəyindən yapışmaq; Learn/be taught smth at your mother's knee-anasının dizinin dibində; Twinkle in one's father's eye-atanın gözündə parıldayanda; Every mother's son of them -hamı, bir nəfər kimi;*

Qohumluq bir ailənin üzvləri arasında statuslarını müəyyən edən rollarının və gözlənilən davranışlarını ehtiva edən sosioji münasibətlər sistemidir. Qohumluq terminologiyalarının sistemli şəkildə öyrənilməsi XIX əsrin ortalarında başlanmışdır. Qohumluq terminologiyalarının tədqiqi ilə məşğul olan ilk etnoqraf L.Morgan ata və ananın əsas və ikinci dərəcəli qohumluq xətləri əsasında 4 qohumluq sistemini (ailə tipi) qeyd edir:

1. İrokez qohumluq sistemi. İrokez qohumluq sistemində ata və ana qohumları bir-birindən ayrılır. Yəni *bioloji ata* və *atanın qardaşı* - ata, ananın qardaşı fərqli adlandırılır.

2. Havay qohumluq sistemi. Havay qohumluq sistemində hər iki əlamətlər üzrə (ata-ana) bir birindən fərqləndirilmir. Başqa sözlə *bioloji ata*, *atanın qardaşı* və *ananın qardaşı* eyni adlanır və ata kimi qəbul olunur.

3. Ərəb qohumluq sistemi. Ərəb qohumluq sistemində ata xətti ilə ana xətti fərqləndirici əlamətləri ilə ayrılırlar. Burada *ata, atanın qardaşı* və *ananın qardaşı* -əmi, *ananın qardaşını* (dayı) ayıraraq müxtəlif adlar vermişlər.

4. İngilis qohumluq sistemi. İngilis qohumluq sistemində bilavasitə və kollateral xətlər bir-birinə qarşı qoyulur, ata və ana xətləri fərqləndirilməyərək eyni terminlə adlandırılır. Bizdə *əmi* və *dayı*-ruslarda *дядя*, ingilislərdə *uncle*, Azərbaycan dilində *bibi* və *xala*, ruslarda *тетя*, ingilislərdə *aunt* adlandırılır. Azərbaycan dilində *qardaş qızı (oğlu), bacı qıaı (oğlu), əmi qızı (oğlu), dayı qızı (oğlu), bibi qızı (oğlu)*, ruslarda *племянница (племянник)*, ingilislərdə *qardaş* və *bacı qızı- niece* (oğlu isə *nephew*); əmi, bibi, xala və dayı uşaqları isə cinsi cəhətdən fərqləndirməyək *cousin* adlanır.

Qohumluq mürəkkəb mədəniyyət sisteminin tərkibidir və hər bir cəmiyyətdə qohumluq qrupları mövcud olduğu kimi qohumluq terminologiyası da var.

Həyatın bir çox aspektinə qohumluq əlaqələri təsir göstərir və əksər cəmiyyətlərdə kiminlə ailə qurmaq, kimə hörmət etmək, kiminlə zarafat etmək, kimə çətin məqamda arxalana biləcəyi kimi məqamlara təsir edir. Qohumluq insanları qrup halında bağlayan qan və nikah bağıdır.

Giddensə görə "Qohumluq ya genetik bağlantılardan və ya evliliyin başladığı bağlardan ibarətdir".

Müsəlman cəmiyyətininin əsasını "nikah" yolu ilə qurulan "Ailə" təşkil edir. Müsəlman ailələrində kişilərə daha çox üstünlük verildiyi üçün "kişi" (man) ailənin başçısı, ağası hesab edilir. Xristian ailələrində isə bu konsepsiya fərqlidir. Burada daha çox ana xəttinə önəm verilir, bu da dinlə əlaqəlidir. *Jesus Christ-the Son of God- His mother Mary (Məryəm ana).*

Nikah qohumluğundan yaranan terminlər də dilimizdə zəngindir. Nikah qohumluğu terminləri aşağıdakılardır: *ər, arvad, qaynata, qaynana, qayın, qayınoğlu, qayınqızı, baldız, baldızoğlu, baldızqızı, kürəkən, gəlin, qardaşarvadı, yeznə, əmidostu, bacanaq, elti, quda, günü* və s. Dialektlərdə işlənən qohumluq terminləri daha genişdir. Məsələn, *gəlinə- şabace, qardaş arvadlna- aba, sonacanı, qayına- nürzə, dayı arvadına- dayıcanı* (Abdullayev, 2013, s.308).

Qohumluq terminlərinin başqa sahələrdə də işlənməsi az deyil. Məsələn, siyasətdə *Big Brother*-Böyük qardaş; *brothers and sisters*- qara-dərililərin siyasi hərəkatlarında, *sisters- feminist* hərəkatında; *fathers and mothers*- rahib və rahibələr; *mother-superios*-rahibə ana; *blood-brotherhood*-kriminal dəstə və s. kimi də işlənirlər.

## Nəticə

Qohumluq mürəkkəb mədəniyyət sisteminin tərkibidir və hər bir cəmiyyətdə qohumluq qrupları mövcud olduğu kimi, qohumluq terminologiyası da var.

Həyatın bir çox aspektinə qohumluq əlaqələri təsir göstərir və əksər cəmiyyətlərdə kiminlə ailə qurmaq, kimə hörmət etmək, kiminlə zarafat etmək, kimə çətin məqamda arxalana biləcəyi kimi məqamlara təsir edir.

## Ədəbiyyat

1. Abdullayev, K.M., Məmmədov, A.Y., Musayev, M.M. (2012). *Azərbaycan dilində mürəkkəb sintaktik bütövlər*. Mütərcim.
2. Abdullayev, S.A. (2013). *Qeyri-səlis dilçilik təcrübəsi*. Victory.
3. Alekhina, A. (1982). *İdiomatic English*. Vyseishaya shkola.
4. Cəfərov, Q. (1985). *Azərbaycan dilinin leksik-semantik xüsusiyyətləri*. Maarif.
5. Qurbanov, A. (2004). *Müasir Azərbaycan dilinin frazeologiyası*. I cild. Nurlan.
6. Koonin, A.V. (2000). *English-Russian Dictionary of İdioms*. Russky Yazyk Publishers.
7. Vəliyeva, N. (2008). *Müxtəlissistemli dillərdə feli birləşmələrin topoloji təhlili*. Avropa.
8. Yusifov, G. (2014). *Azərbaycan və ingilis dillərində sabit söz birləşmələrinin linqvistik-tipoloji xüsusiyyətləri*. Mürtəcim.

Daxil oldu: 06.12.2024
Qəbul edildi: 14.03.2025

https://doi.org/10.36719/2789-6919/43/54-56

**Gülnar Əlizadə**
Milli Aviasiya Akademiyası
https://orcid.org/0009-0009-2778-9068
galizada@naa.edu.az

# Müasir linqvistik və linqvodidaktik məsələlər

**Xülasə**

"Muasir linqvistik və linqvodidaktik məsələlər" dedikdə, müasir dilçilikdəki bütün məsələlər və istənilən bir dilin dil öyrənmə metodları, bunlarla bağlı bütün problemlər nəzərdə tutulur. Ümumiyyətlə, müasir linqvistika dilin ümumi funksiyalarını, strukturlarını, ifadə və istifadə formalarını, bununla yanaşı onun inkişafını öyrənən bir sahədir. Dilçiliyin linqvistika sahəsindən başqa onun Linqvodidaktika adlanan böyük bir sahəsi də vardır. Bu geniş sahə isə dil öyrənmə və tədrisinin nəzəri və praktiki məsələlərini araşdıran bir sahədir.

Dilin 2 əsas sahəsini əhatə edən linqvistika və linqvodidaktika dedikdə, linqvodidaktikada olan aktual problem və məsələlər həm dilin öyrənilməsi və tədrisi ilə, həm də dilin sosial, mədəni və texnoloji aspektləri ilə bağlı geniş müzakirələrə səbəb olur.

Ümumiyyətlə linqvodidaktika, intellektual və nitqin inkişafı, xarici dilin tədrisi prosesi, mədəniyyətlərarası ünsiyyət vasitəsi mənasına gəlir. Digər tərəfdən, linqvodidaktika dedikdə, dilin və onun strukturunun elmi tədqiqi, bununla belə qrammatika, sintaksis və fonetikanın öyrənilməsi, dilçiliyin spesifik sahələri olan sosiolinqvistika, dialektologiya, psixolinqvistika, hesablama dilçilik, müqayisəli dilçilik və struktur dilçilik kimi bölmələrini öyrənən dilçilik sahəsi başa düşülür (Vygotsky, 1986).

***Açar sözlər:*** *linqvistika, linqvodidaktika, yanaşmalar, metodlar, dilçilikdə məsələlər, dil öyrənmə*

**Gulnar Alizadeh**
National Aviation Academy
https://orcid.org/0009-0009-2778-9068
galizada@naa.edu.az

# Modern linguistic and linguodidactic issues

**Abstract**

In "Modern linguistic and linguodidactic issues", all needs in modern linguistics and language learning methods of any language, all related programs are covered. modern linguistics is a field that studies the general functions, structures, expressions and forms of use of the language, as well as its development. In addition to linguistics, there is a large field called Linguodiactics. With this broad scope, it is a field that examines the theoretical and practical issues of language learning and teaching.

Linguistics, which covers 2 main areas of language, is called linguodidactics, which leads to wide discussions about the actual problem in linguodidactics and the learning and teaching of any language, as well as the social, cultural and technological aspects of the language.

In general, linguistic didactics means the development of intellectual and speech, the process of teaching a foreign language, a means of intercultural communication. On the other hand, linguistic didactics refers to the scientific study of language and its structure, including the study of grammar, syntax and phonetics, the specific fields of linguistics, such as sociolinguistics, dialectology, psycholinguistics, computational linguistics, comparative linguistics and structural linguistics.

***Keywords:*** *linguistics, linguistic didactics, approaches, methods, problems in linguistics, language learning*

## Giriş

Müasir linqvistika və linqvodidaktikadan danışdıqda həm onların üstünlükləri, həm onların çətinlikləri, həm də onların qarşılıqlı əlaqəsini vurğulamaq ön plana keçir. Bu hər iki sahənin araşdırılması üçün bunlara fərdi olaraq yanaşmaq, ayrı-ayrılıqda analiz etmək lazımdır.

Muasir linqvistikada əsas məsələlər. Ümumiyyyətlə, müasir linqvistikanın əsas məsələlərini araşdırarkən orada olan əsas anlayışları öyrənmək lazımdır. Müasir linqvistikanın əsas anlayışları aşağıda sadalanan kimidir: strukturalizm, funksionalizm, generativ dilçilik və digər yanaşmaların müqayisəsi (Brown, H. Douglas, 1980).

Strukturalizm dilin əsas və strukturlarını və onların qarşılıqlı əlaqələrinin olduğunu irəli sürən bir yanaşmadır. Bu nəzəriyyənin məğzini dilin planlı və sistemli quruluşa malik olmasını göstərən yanaşma təşkil edir. Ümumiyyətlə, strukturalizm, dilin mənasını və qaydalarını və özü ilə qarşılıqlı əlaqəli olan komponentləri ilə məşğul olur (Saussure, 1916).

**Tədqiqat**

Funksionalizm dilçilikdə dilin əsas məqsədini və funksiyalarını araşdıran bir yanaşmadır. Funksionalizm, dilin strukturundan daha çox onun istifadəsinə, ünsiyyətdə danışanların və yazanların məqsəd və ehtiyaclarına diqqət yetirir. Funksionalistlər dilin əsasən sosial və kommunikativ funksiyalarını ön plana çıxarırlar. Bu yanaşma dilin necə və niyə istifadə olunduğuna fokuslanır və dilin inkişafını həm daxili, həm də xarici faktorlardan asılı olaraq izah etməyə çalışır. Funksionalizm müasir dilçiliyin ən vacib yanaşmalarından biridir, çünki bu yanaşma təkcə dilin strukturunu yox, həmçinin dilin istifadəsini və məqsədini araşdırır. Dilçiliyin bu yanaşması, dilin sosial və kommunikativ aspektlərini aydınlaşdırmağa fokuslanır və dilin yalnızca formalarının deyil, həmçinin məzmununun necə və niyə istifadə olunduğunu araşdırmağa və aydınlaşdırmağa çalışır (Michael, 1973).

Dilçiliyin daha bir aspekt və yanaşmalırndan olan generativ dilçilik dilin strukturuna bağlı olan bir sahədir. Belə ki, Generativ Dilçilik (Generative Linguistics), dilin strukturunu başa düşmək üçün inkişaf etdirilmiş bir yanaşmadır və bu yanaşma əsasında Noam Chomsky tərəfindən təqdim edilən nəzəriyyələr dayanır. Generativ dilçilik, dilin insan beynində təbii olaraq mövcud olan və hər bir insanın dil öyrənmə qabiliyyətini təmin edən daxili bir qrammatika olduğunu iddia edir. Bu yanaşmaya əsasən, dilin öyrənilməsi yalnız xarici təsirlərdən deyil, həm də beynin dilə aid qlobal quruluşlarından asılıdır. Dilin quruluşunu, dilin insan tərəfindən öyrənilməsini təmin edən əsas sahələrdən biri olan generativ dilçilik dilçiliyin əsasını təşkil edir (Noam, 1965).

Linqvodidaktikada müasir yanaşmalar. Komunikativ yanaşma: bu yanaşma əsasən dilin bütün aspektlərinin, yəni dilin bütün sahələrinin birlikdə inkişafı və istifadəsini əhatə edir. Dilin öyrənilməsində əsasən danışıq və yazı bacarıqlarının inkişafına yönəlmiş metodlar da bu yanaşma içərisində birləşmişdir. Bu yanaşma, dilin real həyatda istifadəsinə yönəlir və danışıq, yazı bacarıqlarını inkişaf etdirmək üçün istifadə edilir. Öyrənənlər dilin sosial və kommunikativ funksiyalarını öyrənir və təcrübə ilə bacarıqlarını artırırlar. Bu yanaşma, dilin əsas məqsədini real həyatda kommunikasiya qurmaq və anlaşma metodlarını əhatə edir. Bu yanaşmada danışıq, müzakirə və digər interaktiv məşğələlər vasitəsilə öyrənənlərə dilin gündəlik həyatımızda necə istifadə edildiyi öyrədilir (Claire, 1986).

Kommunikativ yanaşmanın əsas xüsusiyyətləri aşağıdakı kimidir:

Öyrənənlərə real ünsiyyət situasiyalarında dildən istifadə etmə bacarığı təbliğ olunur.

Bu yanaşma sayəsində dilin sosial və mədəni aspektlərini öyrənmək şansı genişdir.

Rəsmi və qeyri-rəsmi yazı və danışıq bacarıqlarının inkişafına xüsusi diqqət yetirilir (David, 1991). Linqvodidaktikanın ən əsas yanaşması olan kommunikativ yanaşmadan başqa, interaktiv, problem-həll yanaşması, avtorizasiya, konstruktivizm və tapşırıq əsaslı yanaşmaları da vardır.

İnteraktiv yanaşma aktiv iştirak və qarşılıqlı əlaqə vasitəsi ilə müzakirələr apararaq, tapşırıqlar əsasında dil bacarıqlarının təcrübəsinə və inkişafına kömək edir. Problem-həll yanaşması isə dildəki praktik problem həll etmə bacarıqlarını, öyrənənlərin sərbəst düşünmə və qərar vermə qabiliyyətini formalaşdırmağa kömək edir. Avtorizasiya Yanaşması öyrənənlərin öz öyrənmə prosesinə nəzarət etmələrini və sərbəst şəkildə dil bacarıqlarını inkişaf etdirmələrinə zəmin yaradır. Bu yanaşma vasitəsilə öyrənicilərə öz biliklərini müstəqil şəkildə artırmağa və öyrənmə strategiyaları hazırlamağa

imkan verilir. Konstruktivizm yanaşması, öyrənənlərin öncəki bilik, bacarıq və təcrübələrini əsas götürərək yeni informasiyaların meydana gəldiyi bir yanaşmadır.

Bu yanaşmanın əsas xüsusiyyətləri onun dil öyrənənlərin fərdi təcrübələrinə əsaslanması, yeni əldə olunan informasiyaların qazanılmış təcrübələrlə əlaqələndirilərək möhkəmləndirilməsidir. Bütün sadalanan bu yanaşmalardan başqa dilin gündəlik həyatımızda istifadəsinə fokuslanan daha bir yanaşma tapşırıq əsaslı yanaşma adlanır. Bu yanaşma dil öyrənilməsini real tapşırıqlar və hadisələr üzərində qurur. Bu yanaşma sayəsində öyrənənlər praktik tapşırıqları yerinə yetirərək dil bacarıqlarını inkişaf etdirirlər. Bu yanaşma öyrənənləri dilin gündəlik həyatımızda necə istifadə olunduğuna hazırlayır.

## Nəticə

Müasir linqvistik və linqvodidaktik məsələlər, dilin öyrənilməsi və öyrədilməsi sahəsində yeni meydana gələn yanaşmaların və metodların dilimizdə öyrənilməsini və tətbiqini həyata keçirir. Strukturalizm, funksionalizm, generativ dilçilik kimi nəzəri yanaşmaların və kommunikativ, problem həlli, interaktiv yanaşmaların tətbiqi, dil öyrənmə prosesinin daha effektiv və praktiki olmasına şərait yaradır. Həmçinin, müasir dilçilik nəzəriyyələri, dilin funksional aspektlərini, sosial və mədəni əlaqələrini təhlil etməklə, dilin real həyatda istifadəsini daha dərindən anlamağa imkan verir.

Linqvodidaktika sahəsində tətbiq olunan yeni metodlar, öyrənicilərin dil bacarıqlarını yalnız nəzəri şəkildə deyil, həm də real dünya şəraitində inkişaf etdirmələrini təmin edir. Kommunikativ yanaşmalar, konstruktivist tədris modelləri, tapşırıq-əsaslı yanaşmalar və müstəqil öyrənmə metodları, dilin öyrənilməsində daha aktiv və effektiv iştirakını təşviq edir (Larsen-Freeman, Diane, 1986).

Bütün bu müasir yanaşmalar və metodlar, dilin həm nəzəri, həm də praktik baxımından öyrədilməsi və öyrənilməsi prosesini müasir tələblərə uyğun olaraq daha geniş və dinamik bir şəkildə inkişaf etdirməyə imkan verir. Bu yanaşmaların tətbiqi, həmçinin dil öyrənicilərinin müxtəlif mədəniyyətlər və sosial mühitlərdə daha uğurlu kommunikasiya bacarıqları qazanmalarını təmin edir (Rod, 2003).

## Ədəbiyyat

1. Brown, H. Douglas (2000). *Principles of Language Learning and Teaching*.
2. Chomsky, N. (1957). *Generativ dilçilik: dilin strukturunun təbii qrammatikası*.
3. Ellis, R. (2003). *Tapşırıq əsaslı yanaşma: real dünya tətbiqləri*.
4. Halliday, M. (1978). *Funksionalizm və dilin istifadəsi*.
5. Kramsch, C. (1993). *Kommunikativ yanaşma: dilin praktiki istifadəsi*.
6. Larsen-Freeman, D. (2000). *Techniques and Principles in Language Teaching*.
7. Nunan, D. (1999). *Problem-həll yanaşması və dil öyrənmə*.
8. Saussure, F. (1916). *Strukturalizm və dilçilik*.
9. Vygotsky, L. (1978). *Sosial interaksiyon və dilin inkişafı*.

Daxil oldu: 16.12.2024
Qəbul edildi: 19.03.2025

https://doi.org/10.36719/2789-6919/43/57-61

**Nigar Süleymanova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0009-0009-8898-0421
amiraslanigar99@gmail.com

# Üslubiyyatın tədrisi və dilin funksional istifadə prinsipləri: düzgünlük, dəqiqlik və aydınlıq

**Xülasə**

Müasir Azərbaycan ədəbi dilinin xarakterik cəhətlərindən biri də onun müxtəlif üslublara malik olmasıdır. Həmin üslubları öyrənən, spesifik xüsusiyyətlərini fərqləndirən bölmə isə üslubiyyat adlanır. Məqalədə elmi-metodiki ədəbiyyatda üslubiyyat məsələlərinin qoyuluşu araşdırılmışdır. Orta məktəbdə üslubi məsələlərin qoyuluşu, bütün üslubların xüsusiyyətləri qısa şərh edilmişdir. Həmçinin, məqalədə dilçi alimlərin fərqli bölgüləri və təsnifatları nəzərdən keçirilmişdir. Nitqin üslubi baxımdan düzgün formalaşması Ana dili dərsləri zamanı üslubların tədrisində aparılan əlaqələndirmə və ümumiləşdirmə məsələləri izah edilmişdir. Həmçinin, nitqin düzgünlük, dəqiqlik, aydınlıq kimi əsas xüsusiyyətləri üslubiyyatla əlaqələndirilərək, nəzərdən keçirilmişdir.

***Açar sözlər**: üslubiyyat, bədii üslub, elmi üslub, rəsmi-işgüzar üslub, məişət üslubu, metodika, dilçilik, düzgünlük, dəqiqlik, aydınlıq*

**Nigar Suleymanova**
Azerbaijan State Pedagogical University
https://orcid.org/0009-0009-8898-0421
amiraslanigar99@gmail.com

# Teaching stylistics and functional use principles of language: correctness, accuracy and clarity

**Abstract**

One of the characteristic features of modern Azerbaijani literary language is its possession of various styles. The section that studies these styles and distinguishes their specific features is called stylistics. This article investigates the formulation of stylistics issues in scientific-methodical literature. The presentation of stylistic issues in secondary school and a brief explanation of the characteristics of all styles are provided. Additionally, different classifications and divisions of linguistic scholars are examined. The proper formation of speech from a stylistic perspective, as well as the coordination and generalization issues in teaching styles during mother tongue lessons, are explained. Furthermore, the main characteristics of speech such as correctness, accuracy, and clarity are discussed in relation to stylistics.

***Keywords:** stylistics, literary style, scientific style, official-business style, everyday style, methodology, linguistics, correctness, accuracy, clarity*

## Giriş

Dilçilikdə "stilistika" termini ilə paralel işlənən üslubiyyat, üslubları öyrənən və dil vasitələrindən məqsədyönlü istifadə üsulu kimi işlənən dilçilik terminidir. Bu termin dilin ifadə imkanlarını, onun müxtəlif sahələrdə tətbiq formalarını və bu tətbiq formalarının xarakterik xüsusiyyətlərini əhatə edir (Axundov, 1988). Üslubiyyatın mahiyyəti ondan ibarətdir ki, hər bir üslubun özünəməxsus xüsusiyyətləri, tətbiq dairəsi və kommunikativ məqsədləri mövcuddur.

Metodik ədəbiyyatdan da məlumdur ki, üslub anlayışı incəsənət termini kimi qəbul edilir, üslubiyyat isə dilçilik terminidir və konkret olaraq dilin üslublarını, onların işlənmə mexanizmini araşdırır (Qasımov, 2010). Üslubiyyat iki əsas formada özünü göstərir: fərdi üslub və funksional

 

üslub. Fərdi üslub, adından da göründüyü kimi, bir şəxsə aid olub, xüsusi səciyyə daşıyan üslubdur. Fərdi üslub həm dövrün ümumi fikrindən, həm də şəxsiyyətin fərdi baxış tərzindən asılı olaraq formalaşır. Belə ki, hər bir insanın nitq mədəniyyəti, danışıq tərzi, yazı üslubu onun fərdi üslubunu təşkil edir. Fərdi üslub əsasən yazıçılar, şairlər, alimlər və digər yaradıcı şəxslərin əsərlərində özünü daha qabarıq göstərir. Bu üslubun formalaşmasına şəxsin təhsil səviyyəsi, dünyagörüşü, yaşadığı cəmiyyətin sosial və mədəni xüsusiyyətləri böyük təsir göstərir.

Cəmiyyətin müxtəlif sahələrini əhatə edən, hamının dil vahidlərindən məqsədyönlü istifadəsinə xidmət edən üsluba isə funksional üslub deyilir. Funksional üslublar müəyyən dil qaydaları çərçivəsində formalaşır və müxtəlif kommunikativ sahələrdə tətbiq olunur. Metodik ədəbiyyatda funksional üslublara ədəbi dilin bədii üslubu, elmi üslubu, publisistik üslubu, məişət üslubu, rəsmi-işgüzar üslubu daxildir.

**Tədqiqat**

Lakin görkəmli alim Həsrət Həsənov ədəbi dilin funksional üslublarını daha ətraflı təsnif edərək, onların sayını yeddiyə qədər genişləndirmişdir. O, funksional üslubları aşağıdakı şəkildə qruplaşdırmışdır:

- Ədəbi danışıq üslubu;
- Elmi üslub;
- Bədii üslub;
- Elmi-bədii üslub;
- Rəsmi-işgüzar üslub;
- Epistolyar üslub;
- İctimai-publisist üslub.

Bu təsnifat üslubiyyatın daha dərin və geniş şəkildə öyrənilməsinə imkan yaradır. Qeyd etmək lazımdır ki, orta məktəb proqramı üzrə aparılan bölgü şərti xarakter daşıyır və dövrün inkişafı ilə əlaqədar olaraq dəyişə bilər. Çünki dil dinamik bir sistemdir və zamanla dilin müxtəlif üslublarında dəyişikliklər baş verə bilər.

Üslubiyyatın ən dinamik və dəyişkən sahələrindən biri bədii üslubdur. Bədii üslub dil normalarına riayət etməsi, obrazlı-emosional olması və bədii-ekspressiv xüsusiyyətlərə malik olması ilə xarakterizə edilir. Bədii-estetik fikri daha qüvvətli ifadə etmək üçün sözlərin yerli yerində seçilib işlədilməsi də bədii üslubun əsas xüsusiyyətlərindən biridir.

Bədii üslub yalnız yazılı ədəbiyyatda deyil, həm də danışıq nitqində müəyyən dərəcədə öz əksini tapır. Ədəbiyyat tarixində bir çox şair və yazıçılar bədii üslubun formalaşmasında mühüm rol oynamışdır. Bu üslubun əsas xüsusiyyətlərindən biri də onun emosionallığı və ekspressivliyidir. Ədəbi əsərlərdə bədii təsvir və ifadə vasitələrinin məqsədəuyğun şəkildə işlədilməsi bədii üslubun başlıca xüsusiyyətlərindəndir. Məhz bu səbəbdən “Bədii üslub ekspressivliyin, emosionallığın, bədii təsvir və ifadə vasitələrinin məqsədəuyğun şəkildə, əsərin ideya və məzmununa görə seçilmiş sistemidir” (Həsənov, 2017) ifadəsi bədii üslubu tam şəkildə xarakterizə edir.

Orta məktəb proqramına daxil edilən və tədris olunan digər üslub isə elmi üslubdur. Elmi üslubu digər üslublardan fərqləndirən özünəməxsusluğu onun məntiqli, konkret və dəqiq olmasıdır (Qasımov, 2010). Elmi üslub əsasən elmi əsərlərdə, mülahizələrdə, tədqiqat əsərlərində istifadə olunur. Elmi üslubun ən mühüm xüsusiyyətlərindən biri də onun terminlərlə zənginliyidir. Terminlər elmi üslubun ifadə vasitələrini daha dəqiq və konkret edir.

Orta məktəb dərsliyində elmi üslub konkretlik, ardıcıllıq və dəqiqlik kimi xüsusiyyətlərlə xarakterizə edilir. Onu da qeyd edək ki, elmi üslubun tədrisi inteqrativ xüsusiyyətə malikdir, yəni bu üslub digər sahələrlə qarşılıqlı əlaqədə öyrənilir. Elmi məqalələr, dərs vəsaitləri və digər elmi xarakterli materiallar bu üslubda yazılır.

Tədrisdə yer alan digər üslub isə rəsmi-işgüzar üslubdur. Adından da göründüyü kimi, bu üsluba rəsmi - işgüzar sənədlərin dili aiddir. Dövlətçilik ənənələri ilə bağlı olan bu üslub tarixən formalaşmış və arxaik leksikaya, köhnə qəlib ifadələrə malikdir. Sabit leksika, fikrin lakonik ifadəsi və dəqiqlik, eyni zamanda təkmənalılıq bu üslubun ana xəttidir. Digər üslublardan fərqli cəhəti isə yalnız yazılı

nitqə aid olmasıdır. Bu üslubu tədris edərkən şagirdləri əməli yazı nümunəsi ilə tanış etmək və bacarıqları aşılamaq lazımdır.

Dərslikdə verilən digər funksional üslublardan biri isə publisistik üslubdur. Kütləvilik, cəlbedicilik, aydınlıq kimi səciyyələndirilən publisistik üslubdan kütləvi informasiya vasitələrində və sosial təbliğatlarda daha çox istifadə olunur. Elmi-publisistik dil dedikdə müxtəlif elm sahələrinə, siyasətə, dinə və s. məxsus publisistik məqalələrin, kitabların dili nəzərdə tutulur. Bu üslubda yazılmış əsərlərdə yalnız müəyyən bir siyasi məsələni izah etməklə kifayətlənmir, həm də geniş xalq kütlələrini ələ ala bilmək məqsədi ilə publisistikanın ən bariz cəhətlərindən istifadə edilir. Orta məktəb dərsliyində bu üslub “mətbuat dili”, “qəzet dili” və ya “televiziya dili” kimi də qeyd edilir. Publisistik üslub həm şifahi, həm də yazılı formada ifadə oluna bilir. Şifahi publisistikaya televiziya və radio dili, yazılı publisistikaya isə jurnal və qəzet dili aiddir. Yaxşı olardı ki, publisistik üslubun tədrisi zamanı müəllim şagirdləri əyani vasitələrlə tanış etsin və nümunələrlə praktik işə cəlb etsin.

Canlı danışıq üslubu kimi tanınan məişət üslubu sərbəstlik və təbiiliklə xarakterizə edilsə də, özözlüyündə normalara tabe olan üslubdur.

Nitqin üslubi baxımdan düzgün formalaşması Ana dili dərsləri zamanı üslubların tədrisində aparılan əlaqələndirmə və ümumiləşdirmə işlərindən çox asılıdır.

Üslubiyyat, dilin imkanları daxilində hiss və düşüncələri ifadə etməyin müxtəlif üsullarını öyrənən, həmçinin nitqin məqsədinə uyğun şəkildə təşkilinə dair nəzəri və praktiki məsələləri tədqiq edən bir dilçilik sahəsidir. Bu sahə yalnız dilin strukturunu deyil, həm də onun funksional imkanlarını, müxtəlif üslubların tələblərini və məqsədini nəzərdən keçirərək, ifadənin məqsədəuyğunluğunu təmin edən vasitələri müəyyən edir. Üslubiyyatın əsas məqsədi, nitqin düzgün, dəqiq, aydın, həmçinin ifadəli və təsirli olmasını təmin etməkdir.

Həm yazılı, həm də şifahi nitq, dilin quruluş qaydalarına uyğun olaraq müəyyən prinsiplərə əsaslanmalıdır. Bu prinsiplər nitqin əsas məqsədlərini düzgün şəkildə çatdırmaq və dinləyici, ya da oxucu ilə əlaqə qurmaq üçün vacibdir. Nitqdə doğru və məqsədli ifadə vasitələrinin seçilməsi, həm də mesajın səmərəli şəkildə ötürülməsi üçün əhəmiyyətlidir. Nitqin bu prinsiplərə uyğunluğu, həm kommunikasiya prosesinin səmərəli həyata keçirilməsini təmin edir, həm də dilin ifadə imkanlarından optimal şəkildə istifadə edilməsini təmin edir.

Nitqin düzgün, dəqiq və aydın olması, yalnız sözlərin və cümlələrin doğru istifadəsi ilə bağlı deyil, həm də bu sözlərin doğru və məqsədəuyğun şəkildə seçilməsini tələb edir. Düzgünlük, dilin qrammatik və leksik qaydalara uyğunluğudur. Düzgünlük, dilin həm qrammatik, həm də semantik cəhətlərini əhatə edir. Yəni, burada sözlərin və cümlələrin strukturu, həmçinin məna baxımından dəqiqlik və aydınlıq təmin edilir. Bu baxımdan, düzgünlük yalnız qrammatik qaydalara uyğunluğu əhatə etmir, həm də dilin digər səviyyələrində, məsələn, leksik səviyyədə də sözlərin məna uyğunluğu təmin edilməlidir.

Dəqiqlik isə ifadə olunan fikrin konkret və xüsusi mənada təqdim edilməsidir. Dəqiq ifadə, fikrin təfərrüatlarla aydın şəkildə izah olunmasına və qarşı tərəfə yanlış anlamalar yaratmadan çatdırılmasına kömək edir. Bu, çox vaxt nitqdə istifadə olunan xüsusi terminlər, ifadələr və nüansların diqqətlə seçilməsini tələb edir. Məsələn, elmi və texniki yazılarda və ya bədii əsərlərdə daha konkret ifadələrə üstünlük verilir ki, bu da fikrin anlaşılmasını asanlaşdırır. Fikrin dəqiqliklə təqdim edilməsi həm də müzakirə və ya təhlil zamanı mümkün olan qeyri-dəqiqliklərin qarşısını alır.

Aydınlıq isə ifadə olunan fikrin dinləyici və ya oxucu tərəfindən asanlıqla başa düşülməsini təmin edir. Nitqin aydın olması, şübhəsiz, fikrin düzgün şəkildə ötürülməsinə və qarşı tərəfin fikri mənimsəməsinə şərait yaradır. Aydınlıq həmçinin dilin sadəliyi ilə də əlaqəlidir. Mürəkkəb cümlələr, fikrin aydın şəkildə çatdırılmasını çətinləşdirə bilər. Buna görə də dilin aydın olması həm cümlə quruluşunun, həm də söz seçiminin sadəliyini, həmçinin ifadələrin bir-biri ilə ahəngdar olmasını tələb edir. Cümlə quruluşunun sadə olması, fikrin aydın və təsirli şəkildə ifadə olunmasını təmin edir. Məsələn, cümlələrdə uzun və mürəkkəb frazalar və ya çoxsaylı təkrarlar istifadə edildikdə, oxucu və ya dinləyici fikrin məğzini tez bir zamanda başa düşə bilməyə bilər.

Bu üç prinsip - düzgünlük, dəqiqlik və aydınlıq - üslubiyyatın əsas qaydalarını təşkil edir və dilin effektiv istifadəsi üçün vacibdir. Hər biri bir-birini tamamlayır və nitqin məqsədəuyğun şəkildə qurulmasına kömək edir. Düzgünlük, nitqin sintaktik və qrammatik uyğunluğunu təmin edərkən, dəqiqlik,

ifadə olunan fikrin dəqiq şəkildə başa düşülməsini təmin edir. Aydınlıq isə bu fikrin qarşı tərəfə mümkün qədər sadə və anlaşıqlı şəkildə çatdırılmasını təmin edir. Bu üslubi əsaslar düzgün seçilmiş dil vasitələri ilə fikrin tam olaraq və qarşı tərəfi yanıltmadan çatdırılmasına imkan verir.

Üslubiyyatın tədqiqi və öyrədilməsi, həmçinin dilin istifadə sahələrində – elmi, bədii, ictimai və digər üslublarda – düzgün dil seçiminə istiqamət verir. Beləliklə, dilin funksional və üslubi imkanlarını başa düşmək, müxtəlif üslublarda dil vasitələrinin düzgün və məqsədəuyğun istifadə edilməsi, həmçinin kommunikasiya prosesində effektiv nəticələr əldə edilməsini təmin edir. Nitqin məqsədinə və situasiyasına uyğun olaraq sözlərin və cümlələrin seçilməsi və düzgün tətbiqi üslubiyyatın əsas hədəfidir. Bu baxımdan, üslubiyyat yalnız dilin tədrisi deyil, həm də onun tətbiqi və sosial ünsiyyətin inkişafı üçün mühüm bir sahədir. Üslubiyyat dilin müxtəlif üslub xüsusiyyətlərini öyrənərək, həmin üslublarda istifadə edilən dil vasitələrini müəyyənləşdirir. Beləliklə, dilin müxtəlif funksional sahələrində istifadəsi üçün müəyyən üslub formaları ortaya çıxır. Bu üslubların hər biri müəyyən kommunikativ məqsədləri reallaşdırmağa xidmət edir. Məsələn, elmi üslub məlumatların dəqiq və konkret şəkildə təqdim olunmasını təmin edərkən, bədii üslub emosional və estetik təsir yaratmağa yönəlir. Bu səbəbdən, dilin üslub imkanlarını başa düşmək və bu imkanlardan düzgün istifadə etmək çox vacibdir.

Üslubiyyatın əsas məqsədi yalnız zəngin söz ehtiyatını mənimsətmək deyil, həm də bu sözləri düzgün və məqsədyönlü şəkildə istifadə etməyi öyrətməkdir. Bu baxımdan, dilin funksional üslublarının hər biri şagirdin müvafiq sahələr üzrə bacarıqlarını inkişaf etdirir. Məsələn, elmi üslub təhlil və tədqiqat məqsədini güdür, burada dəqiqlik və ardıcıllıq əsas prinsipdir. Bədii üslub isə daha çox emosional və obrazlı ifadə yaratmağa yönəlir. Bu üslubda dil vasitələrinin emosional və ekspressiv potensialından istifadə edilir. İctimai-publisistik üslub isə cəmiyyətlə əlaqədar məsələləri işıqlandıran, geniş auditoriyaya ünvanlanmış üslubdur. Bu üslubda daha çox inandırıcılıq və aydınlıq ön planda olur.

Ədəbiyyat və dilçilik sahəsində görkəmli alimlər üslubiyyata dair bir çox mülahizələr irəli sürmüş və fərqli təsnifatlar ortaya qoymuşlar. İlk sistemli və fundamental əsər, Azərbaycan dilinin üslubiyyatını öyrənən görkəmli alim Əbdüləzəl Dəmirçizadə tərəfindən yazılmışdır. O, dilin təfəkkürlə qarşılıqlı əlaqəsindən çıxış edərək üslubları üç növdə təsnif etmişdir: bədii üslub, elmi üslub və ictimai-siyasi üslub. Həsrət Həsənov isə üslubları daha geniş şəkildə təsnif edərək onlara yeddi növ aid etmişdir. Bu növlər arasında bədii üslubun özünün daha fərqli və kompleks xüsusiyyətləri vardır. Bədii üslubda dil, yalnız məlumat vermək məqsədini güdmür, həmçinin emosional təsir yaratmağa çalışır.

Mövcud dilçilik ədəbiyyatında üslubiyyata aid yazılmış əsərlərdə funksional üslubların növləri haqqında fikir müxtəlifliyi olduğunu dedik. Buna görə də hələ indəyə qədər Azərbaycan dilçiliyində üslubların sabit təsnifi yoxdur. A.Qurbanov belə bir vacib, zəruri və aktual məsələnin həllinə girişmiş, üslubların ağlabatan, məqbul (ümumqəbul) sayıla, hesab edilə bilən, elmi cəhətdən əsaslandırılmış dəqiq, vahid və sabit bir bölgüsünü müəyyənləşdirməyə səy göstərmişdir. O, əsərində müasir dövrdə funksional üslublardan bəhs etmiş və müasir Azərbaycan ədəbi dilinin materialları əsasında XX əsrin II yarısında funksional üslubların (üslub(i) meyar və sərhədlərinə əsaslandığına görə) haqlı olaraq aşağıdakı növlərinin olduğunu göstərmişdir: ədəbi danışıq üslubu, bədii üslub, elmi üslub, rəsmi üslub, publisistik üslub və epistolyar üslub (Qurbanov, 2019).

## Nəticə

Üslubiyyatın tədrisi müasir Azərbaycan ədəbiyyatında və dilində xüsusi əhəmiyyət kəsb edir. Azərbaycan dilində müxtəlif dövrlərə aid olan üslublar dilin zənginliyini və çoxşaxəliliyini əks etdirir. Bu üslublar, cəmiyyətin inkişafı ilə əlaqədar olaraq daim dəyişir və təkmilləşir. Üslubların tədqiqi yalnız dilin inkişafı baxımından deyil, həm də ümumilikdə cəmiyyətin düşüncə tərzinin, sənətin və mədəniyyətinin inkişafı üçün vacibdir.

Üslublar da ədəbi dil kimi normalara əsaslanır. Dialektlərə nisbətdə kütləvi olan ədəbi dilin şəkillənməsində üslublar xüsusi əhəmiyyət kəsb edir. Üslubi imkanları özündə ehtiva edən ədəbi dil haqqında Dəmirçizadə qeyd edir ki, "ədəbi dil bir spesifik xüsusiyyətləri ilə fərqlənən və belə xüsusiyyətlər, əlamətlər sistemi ilə də qollara ayrılan vahid ümumxalq dilinin adi forması kimi

anlaşılmalıdır. Bu isə o deməkdir ki, ədəbi dilin əsasını ümumxalq dili vahidləri hamı üçün ümumi cəhətlər təşkil edir. Lakin bununla yanaşı olaraq bir sıra məhdud sahələrlə əlaqədar spesifik cəhətlərə malik olduğundan ədəbi dil ifadəlilik vasitələri sisteminə görə müxtəlif qollara ayrılır ki, buna da ümumiləşdirilmiş halda ədəbi dilin üslubları deyilir" (Dəmirçizadə, 1962).

Son olaraq qeyd etmək lazımdır ki, dilin üslubi xüsusiyyətləri, yalnız dilin özünü deyil, həm də onun istifadəçisi olan cəmiyyəti və bu cəmiyyətin düşüncə və ünsiyyət tərzini əks etdirir. Bu səbəbdən, üslubiyyat sahəsinin tədrisi, dilin müxtəlif funksional xüsusiyyətlərini, nitqin təsirli şəkildə qurulması və nitq mədəniyyətinin inkişafını təmin edir. Bu da öz növbəsində, nitqin doğru, dəqiq və məqsədli istifadə olunmasına yol açır.

**Ədəbiyyat**

1. Abbasov, Ə. Orta ümumtəhsil məktəblərinin V-VIII siniflərində Azərbaycan dilindən proqram materiallarının planlaşdırılması. *Azərbaycan dili və ədəbiyyatı tədrisi*. №1, 1998, s.54-63.
2. Ağakişiyeva, Ş. (2018). Üslubiyyatın tədrisi məsələsi. №4.
3. Axundov, A. (1988). *Dilçilikdə üslubiyyat məsələləri*. Elm.
4. Balıyev, H. (2014). *Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası*. Maarif.
5. Cahangirov, M. (1989). *Milli təşəkkül mərhələsində Azərbaycan ədəbi dilinin aparıcı üslubları*. II hissə. Elm.
6. Dəmirçizadə, Ə. (1962). *Azərbaycan ədəbi dilinin üslubiyyatı*. Azərtədrisnəşr.
7. Əliyev, K. (2001). *Nitq mədəniyyəti və üslubiyyatın əsasları*. Bakı Dövlət Universiteti.
8. Həsənov, H. (2017). *Ədəbi dilin funksional üslubları*. Təhsil.
9. Həsənov, H. (2003). *Nitq mədəniyyəti və üslubiyyatının əsasları*. Bakı Dövlət Universiteti Nəşriyyatı.
10. Qasımov, Q. (2010). *Azərbaycan dilinin üslubları*. Nurlan.
11. Məmmədli, M. (2005). *Dil və üslub problemləri*. Şərq-Qərb.
12. Qurbanov, A. (2019). http://afadqurbanov.az/az/page/72

Daxil oldu: 03.12.2024
Qəbul edildi: 11.03.2025

https://doi.org/10.36719/2789-6919/43/62-66

**Aynura Bakirova**
Odlar Yurdu University
https://orcid.org/0000-0002-8268-3954
aynure.bekirova@oyu.edu.az
**Aybaniz Ismayilova**
Odlar Yurdu University
https://orcid.org/0000-0001-9931-9254
ismayilova.aybeniz@oyu.edu.az

# Formation of Environmental Culture Through Learning a Foreign Language

**Abstract**

The article touches upon the topic of developing environmental culture in young people through learning a foreign language. It also provides an example of studying environmental issues in English classes, and analyzes all the advantages and disadvantages of this method. Environmental culture is a system of values, knowledge, norms, and behavioral practices aimed at respecting nature, preserving the environment, and sustainable interaction with ecosystems. It embodies a conscious human desire to balance their needs and the needs of nature. Environmental culture plays an important and multifaceted role in modern society and our attitude to the environment. Environmental culture is undoubtedly the most important core of modern society. It does not simply call for caring for nature, it sets an imperative task for each of us – to be responsible for the future of our planet. Nowadays, environmental problems have become more acute than ever: climate change, destruction of ecosystems, and environmental disasters – all this requires active intervention and global efforts. The introduction of environmental values and principles into everyday life is becoming an urgent need. This means careful use of natural resources, reducing the negative impact on the environment and supporting sustainable consumption standards. Ecological culture inspires the creation of a healthy, clean and sustainable environment for us and future generations. The article analyzes the method of forming ecological culture in the younger generation through learning a foreign language. A foreign language as an effective factor in the socio-economic, scientific, technical and general cultural progress of society and as a means of communication has potential in terms of environmental education. Consideration of environmental problems, issues of interaction between man and nature, nature conservation and resource conservation when studying a foreign language increases students' interest, expands their vocabulary, and encourages active communication. Familiarization with environmental problems abroad allows us to draw a parallel with similar situations in our country, helps to see certain achievements of each country in the field of preserving and maintaining ecological balance.

***Keywords**: ecological culture, ecological problems, balance, global efforts, foreign language learning, active intervention*

**Aynurə Bəkirova**
Odlar Yurdu Universiteti
https://orcid.org/0000-0002-8268-3954
aynure.bekirova@oyu.edu.az
**Aybəniz İsmayılova**
Odlar Yurdu Universiteti
https://orcid.org/0000-0001-9931-9254
ismayilova.aybeniz@oyu.edu.az

 

